*Mən Aşığam, lələ mən,*
*Qəflətdəyəm hələ mən.*
*Dərddən, qəmdən, hicrandan*
*Bağlamışam şələ mən.*
**Sarı Aşıq**



**№3(10)**
**2013**

**Bakı-2013**

**Laçın yurdu, №3(10), 2013**
**Bakı, "Bəxtiyar-4", 2013. – 96 səh.**

Təsisçi və baş redaktor:
**Arif MƏMMƏDLİ**

Baş redaktorun müavini:
**Araz HACIYEV**

Məsul katib:
**Elnur MEHDİYEV**



Redaksiyanın ünvanı:
**Sabit Rəhman küç. 7**
Əlaqə:
**Tel.: (050) 291-34-52, (070) 956-36-22, (050) 205-00-92**
**e-mail: lachinyurdu@mail.ru**

Dərgidə dərc olunan yazılar müəlliflərin mövqeyini əks etdirir
və yazı müəllifləri məsuliyyət daşıyır.
Jurnal 16.03.2010-cu il tarixdə Azərbaycan Respublikasının Ədliyyə
Nazirliyində 3133 №-li reyestrlə qeydiyyatdan keçmişdir.

Bankın adı: **Azərbaycan Beynəlxalq Bankı MƏTBUAT şöbəsi**
Bankın kodu: **805142**,
Müxbir hesabı:
**AZ03NABZ01350100000000002944,**
VÖEN: **9900001881**
SWIFT: **IBAZAZ2X**,
Müştərinin hesabı:
**AZ64IBAZ41040019443136196216**
**Məmmədov Arif Kamran oğlu**
VÖEN:**1401771462**

Intermediary Bank:
**Citibank NA, New York, USA**
Corr. account: **36083186**
SWIFT: **IBAZAZ2X**,
International Bank of Azerbaijan Republic
Yasamal Branch
kod: **805142**
USD only Account #:
**AZ64IBAZ41040019443136196216**
**Mammadov Arif Kamran**
INN**: 1401771462**

## BU SAYIMIZDA

*Laçınlı gənclərlə görüş keçirilmişdir* ........................................................ 6
*Laçının icra başçısı Bakıda da rayon gəncləri ilə görüşmüşdür* ........... 7

***O kənd bizim kəndimizdi***

Sultan HÜMBƏTOV, *Ərikli kəndi* ......................................................... 9

***Poeziya***

Pənah MİKAYILOV ................................................................. 20
Allahverdi ƏLİYEV ................................................................. 29
Yusif Hacı oğlu ŞABANOV ..................................................... 38
Tofiq YUSİF ........................................................................... 42
İlham QƏHRƏMAN ................................................................ 52
Araz ELSEVƏR ...................................................................... 74
Namiq ZAMAN ....................................................................... 86
Elnur İRƏVANLI ..................................................................... 90
Alimə GİZLİNUR ..................................................................... 91
Elburus ABBASOV ................................................................. 93
Seyid CƏFƏR ......................................................................... 94

***Qarabağ qaziləri***

Xalid BAHADUROĞLU, *Vətənin dar günündə* .................................. 22
Aqşin Məmmədov ..................................................................... 39

***Nəsr***

Venera MİRZƏYEVA, *Pele öküzün əhvalatı* .................................. 24
Fəxri UĞURLU, *Dərviş* ............................................................ 64
Təranə VAHİD, *İki hekayə* ....................................................... 80

***Sənətçilərimiz***

Tacir SƏMİMİ, *Aşıq Adil Cəfakeş* ............................................. 27

### *Kitab rəfi*

*“Sən yanımda olmayanda”* ........................................................................28
*“Kimya müəssisələrində investiya siyasətinin formalaşması istiqamətləri”* ........................................................................37
*“Zəngəzur toponimləri”* ........................................................................79
*“Ömür bitər, yol bitməz”* ........................................................................85

### *Ellərimiz*

Sultan HÜMBƏTOV, *Qasımuşağı tayfası* ..............................................30

### *Dişi aslanlarımız*

Kişi Tavat ........................................................................................40

### *Bioqrafik tanıtım*

İlham Musayev ....................................................................................41

### *Folklorumuz*

Xanlar əminin gülməcələri .....................................................................43

### *Yaddaş*

Mənzum ərizə .......................................................................................47

### *Dost sözü*

Hüseynbala EYVAZOV, *“Ümidlə yaşanan ömür”* ...............................48
Vaqif QURBANOV, *“Mənim “Bahadur müəllim” adlı bir dostum vardı”* ........................................................................75

### *Alın yazısı*

Qəhrəmanlar ölmürlər ..........................................................................50

### *Publisistika*

İmdad ƏLİZADƏ, *“Qürbətə sarı” (II yazı) -ardı* .................................53

*Dünya ədəbiyyatı*
Robin ZİGER, *"Zəfər üçün doğulanlar" (davamı)* ................................58

*Xatirə*
Rəfiqə ƏSGƏROVA, *"İlk müəlliməm"* ................................................61

*Münasibət*
Araz ELSEVƏR, *"Xəyanət, yoxsa qurulmuş imperiya oyunu?"* ..........72

*Axtar babaları*
Alxan Əhməd oğlu Əhmədov ...............................................................78

*Kimlər keçdi bu dünyadan*
K.RƏHMANLI, *"O, yaradıcı insan idi"* ..............................................87

*Ziyalılarımız*
Müəllim ömrü .........................................................................................88

*Veteranlarımız*
Əbil Şahverdi oğlu Sadıqov ..................................................................92

*Araşdırma*
Araz YAQUBOĞLU, *II Dünya Müharibəsində itkin düşən laçınlılar*...95

## HÖRMƏTLİ OXUCULAR!

**"Hər kənddən, hər məktəbdən 1 abunəçimiz olsun, hər kəs 1 jurnal alsın!"** kampaniyası davam edir. Bu kampaniyaya qoşulanlara bəri başdan öz təşəkkürümüzü bildiririk.

Xatırladaq ki, jurnalımızı metro keçidlərindən və "Azərmətbuatyayımı"nın Sumqayıt, Gəncə, Mingəçevir, Bərdə, Ağcabədi, Yevlax, Qax və Şəki şəhərlərindəki köşklərindən almaq olar.

**Əziz oxucular,** jurnalımız hələlik rübdə bir dəfə (ildə 4 nömrə) çıxır, **illik abunə qiyməti 8 manatdır.** İnşallah, növbəti sayımız **2013-cü ilin sentyabr ayında** işıq üzü görəcək.

# LAÇINLI GƏNCLƏRLƏ GÖRÜŞ KEÇİRİLMİŞDİR

İyunun 22-də Taxtakörpü qəsəbəsində Ağcabədi və ətraf rayonlarda məskunlaşmış laçınlı gənclərlə görüş keçirilmişdir. Tədbirdən əvvəl laçınlı gənclər ulu öndər Heydər Əliyevin Laçın Rayon İcra Hakimiyyətinin inzibati binası qarşısında ucaldılmış büstünü və Taxtakörpü qəsəbəsində rayon şəhidlərinin adının əbədiləşdirildiyi xatirə kompleksini ziyarət etmiş, hər iki abidə önünə tər güllər düzmüşlər.

Sonra tədbir İcra Hakimiyyətinin akt zalında davam etdirilmişdir. Dövlət himninin səsləndirilməsi ilə başlayan tədbiri Laçın Rayon İcra Hakimiyyətinin başçısı Akif Səlimov açaraq giriş nitqində ümummilli liderimiz Heydər Əliyevin gənclərə olan sonsuz diqqət və qayğısından danışmış, çıxışında prezident cənab İlham Əliyevin rəhbərliyi ilə son illərdə görülən işlərə geniş yer ayırmışdır.




Tədbirdə "Ulu öndər Heydər Əliyev və Azərbaycan gənclərinin vətənpərvərlik tərbiyəsi" mövzusunda məruzə dinlənilmiş, əsası ulu öndər Heydər Əliyev tərəfindən qoyulan gənclər siyasətinin, gənclərə qayğının hazırda Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən uğurla davam etdirilməsi, məhz bu uzaqgörən dövlət siyasəti sayəsində əldə edilmiş nailiyyətlər barədə məlumat verilmişdir.

# LAÇININ İCRA BAŞÇISI BAKIDA DA RAYON GƏNCLƏRİ İLƏ GÖRÜŞMÜŞDÜR



İyunun 29-da isə Laçın Rayon İcra Hakimiyyətinin başçısı Akif Səlimov Bakıda rayon gənclərinin bir qrupu ilə görüşmüşdür. "İlham Əliyev və Azərbaycan gəncliyi" mövzusunda baş tutan görüşdə icra başçısı gənclərin məruzələrini dinləmiş, onların suallarını cavablandırmışdır. O, çıxışında vurğulamışdır ki, laçınlı gəncləri bir araya toplamaqda məqsəd onları bir-biri ilə tanış etməkdir:

"Sizlərin içərinizdə Laçında doğulanlar da, Laçından kənarda dünyaya gələnlər də var. Amma heç vaxt bu tərkibdə görüşməmisiniz. İstəyirəm ki, milli-mənəvi dəyərlər ətrafında birlikdə fikir mübadiləsi aparaq, təklif və təşəbbüslərinizi eşidək, ideyalarınız ətrafında həmfikir olaq".

Daha sonra söz gənclərə verilmişdir. Laçın rayon Gənclər və İdman İdarəsinin rəisi Natiq Mustafayev gənclərə yaradılan şəraitə görə ölkə başçısına təşəkkürünü bildirmişdir. Onun sözlərinə görə, elm, mədəniyyət, idman sahələrində gənclərə daim diqqət və qayğı göstərilir: "Təəssüf edirəm ki, dövlət orqanlarında işləmək üçün verilən elanlara laçınlı gənclər arasında müraciət edənlər azdır. Ümid edirəm ki, gənclər onlara verilən fürsətlərdən səmərəli istifadə edə biləcək".



Milli qəhrəman övladı Asəm Eyvazov qeyd etmişdir ki, gənclərə açıq qapı yaradılıb və laçınlı gənclər qarşıdakı seçkilərdə prezident İlham Əliyevi dəstəkləməlidirlər.

Erməni əsirliyində olarkən görmə qabiliyyətini

itirən Nurlana Hümbətova Laçına həsr etdiyi şeiri oxumuş və söyləmişdir ki, mən gələcəyin müəllimələsiyəm, təhsil alıram. Qardaşım ali təhsillidir, hazırda Vətənə xidmət edir. Laçın üçün darıxıram və inanıram ki, tezliklə doğma yurdumuza qayıdacağıq. O, bu cür görüşü təşkil etdiyinə görə icra başçısına minnətdarlığını çatdırmışdır.

11-ci sinif şagirdi Elmar Aslanov isə Laçını görməsə də, ailə üzvlərinin danışığından Laçına aşiq olduğunu demişdir : “Dayım Laçın uğrunda gedən döyüşlərdə vuruşub. Biz öz torpaqlarımızı geri qaytarmaq əzminə malikik. Bunun üçün ölkə prezidentinin ətrafında sıx birləşmişik”.




Şəhid oğlu Hikmət Salmanov bildirmişdir ki, o, Laçının və Azərbaycanın digər işğal olunmuş torpaqlarının azad edilməsi üçün əlinə silah alıb vuruşmağa və atası kimi şəhid olmağa hazırdır. Hikmət Salmanov Akif Səlimovun icra başçısı kimi laçınlı gəncləri hərbi məktəblərdə təhsil almağa yönəltdiyini, Azərbaycan Silahlı Qüvvələrinin gələcək zabit və generalları

arasında laçınlı gəncləri daha çox görmək üçün məqsədyönlü fəaliyyət aparmasını alqışlamışdır.

Tədbirdə çıxışı zamanı həm özü kövrələn, həm də dinləyiciləri qübarlandıran şair İlham Qəhrəmanın qızı Nigar Qəhrəmanovanın son dərəcə səmimi və təsirli nitqi icra başçısı Akif Səlimov da daxil olmaqla salona toplaşanları qəhərləndirmişdir.

Bundan başqa Laçın məktəblərinin müəllimləri, laçınlı tələbələr də öz fikirlərini bölüşmüşlər. Gənclərin çıxışından sonra söz alan Akif Səlimov laçınlı gənclərin potensialından yetərincə istifadə etməyin zəruriliyini önə çəkmişdir: "İndiyədək istedadlarımızı tanıya bilməmişik. Mən istərdim ki, bu tədbirdə iştirak edən gənclərimiz bilsinlər ki, Laçın oğulları kifayət qədər döyüşüb. Bu gün istəyirəm ki, ümumilli lider Heydər Əliyevin qoyub getdiyi stabil ölkəmizdə hər bir gənc torpaqlarımızı azad etmək üçün döyüşə və qəhrəmanlığa hazır olsun. Əminəm ki, qarşıdan gələn seçkilərdə gənclər cənab İlham Əliyevin ətrafında sıx birləşəcək və məhz bu həmrəylik bizi qələbəyə aparacaq, Laçına qaytaracaq".

## O KƏND BİZİM KƏNDİMİZDİ

## ƏRİKLİ KƏNDİ

**Kəndin tarixi durumu:** Sovet imperiyası öz müqavimətini saxlaya bilməyib ləngər vuran kimi mənfur qonşularımız olan erməni təcavüzkarları uzun illərdən bəri torpaqlarımıza olan nəfslərini heç cür saxlaya bilmədilər, öz arzularına yetmək üçün.... Nəticədə Qarabağ müharibəsi, şəhidlər, talan edilib yer üzündən silinən şəhər, qəsəbə və kəndlərimiz, erməni vəhşilikləri, qaçqın və köçkünlərin karvanı dayandı gündəmdə. Yurdumuzun qəlbinə vurulmuş bu yaralara sarğı qoymaq məqsədilə vaxtaşırı Laçın rayonunun bəzi kəndlərinin tarixinə, mədəniyyətinə, əhalisi və onların məşğuliyyətlərinə diqqət yetirməyə çalışırıq.

Bu gün işğal edilmiş, eyni zamanda işğal altında tutulan torpaqlarda vaxtilə salınmış və bu gün viran edilmiş hər bir kəndin öz tarixi, salınma səbəbi olmuş, kəndlərin sayı ayrı-ayrı zamanlarda müxtəlif miqdarda zaman və quruluşdan asılı olaraq dəyişmişdir.

Laçın rayonunun Kürdhacı kəndinin inzibati ərazi vahidində qərarlaşan, Qasımuşağı obasının digər kəndləri ilə baş-başa verən Ərikli kəndinin salınma tarixi də çox maraqlı olmuşdur. Əriklilərin qədim adət-ənənələri, Ərikli kəndinin təbii gözəllikləri, diş göynədən saf bulaqları, əhalisinin özünəməxsus məişəti, həyat tərzi, məşğuliyyətləri olmuşdur.



İbrahim Bayramovun "Qərbi Azərbaycanın türk mənşəli toponimləri" adlı kitabında apardığı tarixi araşdırmadan məlum olur ki, Ərikli – Yelizavetpol (Gəncə) quberniyasının Zəngəzur qəzasında, Qarakilsə (indiki Sisyan rayonu) ərazisində kənd olmuşdur. Bu kənd Qafqazın 5 verstlik xəritəsində qeyd edilmişdir. Kənddə 1873-cü ildən başlayaraq müxtəlif illərdə aparılmış siyahıya alma zamanı kənd sakinlərinin azərbaycanlılar olduğu qeyd edilmişdir. Nəhayət, 1917-1918-ci illərdə azərbaycanlılar bu kənddən qırğınlarla deportasiya edilmiş, kənd dağıdılmış və bu günə qədər də xarabalığa çevrilmiş şəkildə qalmaqdadır.

Tanınmış filoloq, tədqiqatçı-alim Əli Umud oğlu Əliyevin apardığı araşdırmalardan məlum olur ki, bu kənd Qarakilsə (indiki Sisyan) rayonunun ərazisində, vaxtı ilə Qarabağın sərhədlərini tamamlayan Ərikli dağlarının ətəyində, Ərikli çayının sahilində yerləşirdi. Erməni cəlladları Ərikli kəndini də digər Qərbi Azərbaycan kəndləri kimi talan-qarət etmiş, əhali doğma dədə-baba yurdundan didərgin düşmüşdür. Pərən-pərən olmuş əriklilər Azərbaycanın müxtəlif ərazilərində məskunlaşmış və məskunlaşdıqları əraziləri "Ərikli" adlandırmağa çalışmışlar.

Erməni millətçilərinin apardıqları siyasət nəticəsində öz dədə-baba yurdundan, Dərələyəz mahalından köç etməyə məcbur olan Heydərin ulu babası Qarakilsədə (indiki Sisyan), Ərikli kəndində məskunlaşmağa məcbur oldu. Heydər burada – Yelizavetpol (Gəncə) quberniyasının Zəngəzur qəza-

sında, indiki Qarakilsə (Sisyan) rayonu ərazisində mövcud olmuş Ərikli kəndində dünyaya göz açdı. Bir müddət sonra erməni separatçıları tərəfindən azərbaycanlılar yaşayan kənd əhalisinin vəziyyəti getdikcə ağırlaşdırılırdı. Bu səbəbdən də Heydərgilin ailəsi Zəngəzur mahalının Hacısamlı nahiyəsinin (indiki Laçın rayonunun) Qasımuşağı obasının (indiki Kürdhacı inzibati ərazi dairəsinin) ərazisinə pənah gətirdilər. O dövrdə arandan yaylağa və yaylaqdan arana gedən köçlər tez-tez bu ərazilərə düşüb gecələdikdən sonra yollarına davam edərdi. Lakin Qasımuşağı obasının Aşağı Qarasaqqal kəndi ilə Araxış (Sovet hakimiyyətinin ilk illərində kənd əhalisi digər kəndlərə köçürülmüş, Araxış kəndi ləğv edilmişdir. Kollektivləşmə dövrünə təsadüf edən bu köçürmənin əsas məqsədi kəndliləri nəzarətdə saxlamaq və əhalini məcburi sürətdə kolxoz quruculuğuna cəlb etmək olmuşdur. Xatırladaq ki, Araxış kəndi 1727-ci ildə Xaçın məlikliyinin tərkibində yerləşən Məğavuz nahiyəsinin kəndlərindən biri olmuş və siyahıya alma zamanı Araxoş kimi qeyd edilmişdir) kəndinin arasında Sarıdaş adlanan yerlə üzbəüz sahədə lövbər salan Heydərgilin köçü isə bir neçə gün idi burada gecələyirdi. Köçün burada məskən salıb qalmasından xəbər tutan ağsaqqallar Qasımuşağı obasından çapar göndərirlər ki, gedin, baxın, onların atları və öküzləri arıq, itləri yallıdırsa qonşuluqda yaşasınlar, yox, əgər belə deyilsə qovun getsinlər. Həmin dövrdə heç kəs kasıb qonşu istəməzdi. Ona görə də kişilər qoçaq və zəhmətkeş olarsa, onların atları və öküzləri arıq, qadınlar evdar və işgüzar olarsa itləri yallı olardı. Göndərilən çapar qayıdır, söyləyir ki, siz deyən kimidir. Hətta çox bəd itləri var. Elə buna görə də bəzən el arasında bu tayfaya "Heydərli" yox, "it Heydərli" deyirlər. Beləliklə, Heydərgilin ailəsi burada məskən salmışdır. Zəngəzur mahalının Hacısamlı nahiyəsində, Qasımuşağı obasının ərazisində Ərikli kəndinin əsası bax beləcə qoyuldu. Əvvəllər əsasən "bağdadi", "tağbənd", "xərək", "potuğa", "dam" ("qara dam", "şirvanı dam") və digər yerli şəraitə uyğun yeraltı qazmadan düzəldilmiş olan yaşayış evləri sonda yerli tikinti materiallarından tikilmiş ikimərtəbəli yaraşıqlı evlərlə əvəz olundu.

Dərələyəzli Heydər burada ailə qurur və bu evlilik zamanı Alıbəy və Bağır adlı oğlanları olur. Bağır Heydəroğlu Xanxanımla ailə qurmuş, bu evlilik zamanı İmamverdi, Vəliməmməd (arvadı – Ağapəri), Xıdır, Əliməmməd adlı oğlanları dünyaya gəlmişdir. Qeyd edək ki, publisist, geneoloq Ənvər Çingizoğlunun apardığı araşdırmalardan məlum olur ki, 1827-ci ildə Mehdiqulu xana bağlı Hacısamlı camaatının Qasımuşağı obası dövlət tərəfindən siyahıya alınıb. Həmin siyahıda yuxarıdakı qeydlər öz əksini tapmışdır.

Alıbəy Heydər oğlunun isə Rəhim, Kərim, Məşədivəli adlı oğlanları olmuşdur.

Dərələyəzli Heydər çox sərt, cəsur, lakin olduqca inadkar və tərs bir adam olmuşdur. Odur ki, müdrik kəlamlar ustadı, el ağsaqqalı, öz ədaləti ilə tanınan, Hacısamlı nahiyəsinin bəyi Əlipaşa bəy Sultanov belə deyərmiş: "Atınızı elə sürün ki, Heydərlinin suyuna dəyməsin, yoxsa atınız bədnal olar". Yəni atınız tündləşər, bədliyə (tərsliyə) durar, nallamağa qoymaz.

Ərikli sözünün etimologiyasını bəzi tədqiqatçı alimlər fitotoponim kimi qəbul edərək "çoxlu ərik ağacı olan yer", "ərik bağı", "keçmişdə ərik bağları olmuş Ərikli adlı yer" kimi qəbul edirlər. Bu yerlərdə nə çoxlu ərik ağacı, nə də ərik bağı olmuşdur. Bəzi tədqiqatçılar isə hesab edirlər ki, bu söz etnotoponimdir. Əslində Ərikli sözünün etnotoponim olması düzgündür və Ərikli sözü "ər" tayfasının adı ilə bağlıdır, yəni ərlər, ərənlər məskunlaşdığı yer anlamını verir.

Kəndin ərazisində Qafqaz Albaniyası dövrünə aid tikinti qalıqları, müxtəlif səpkili, müxtəlif tipli yazılı daş abidələr, Alban qəbiristanlığının qalıqları mövcud idi. Kürdhacı kəndi ilə Ərikli kəndinin sərhədində böyük bir Alban məbədi qərar tutmuşdu. Abidənin üzərində çoxlu daş kitabələr yerləşirdi. Məbəddən bir az aralıda Alban qəbiristanlığı var idi.

Mənəvi sərvətlərimizi min bir yolla oğurlayan mənfur erməni qonşularımız Ərikli kəndi ərazisində olan müxtəlif tarixi Alban abidələrini də müxtəlif yollarla, dəyişikliklər aparmaqla özününküləşdirməyə çalışmışdır.

**Kəndin mədəniyyəti:** Hər bölgənin, hər bir kəndin özünəməxsus mədəniyyəti vardır. Qasımuşağı obasının ərazisində qərar tutan digər kəndlərlə ara məsafəsinin yaxın və əhalinin qohumluq əlaqələrinin olması səbəbindən Ərikli kəndinin də mədəniyyəti və adət-ənənələri həmin kəndlərlə eynilik və oxşarlıq təşkil edir. Kənd əhalisi sayına görə az olsa da, burada mədəniyyətin müxtəlif sahələri inkişaf etmişdir. Kənd əhalisi heyvandarlıq və əkinçilik sənətinə, həmçinin xalçaçılıq və toxuculuq işləri ilə yanaşı, müxtəlif sənət növlərinə önəm vermişdilər. XX əsrin əvvəllərində sadə əyiricilik və toxuculuq alətləri ilə ip əyrilməsi, xalça toxunulması adət və ənənə halını almışdır. Demək olar ki, ailələrin çox hissəsində toxucu dəzgah (hana və yer hanası) var idi. Onlar hazırladıqları yun və pambıq iplərdən xalça, kilim, palaz, fərməş, xurcun, şəddə, yun şal (parça) və digər xalça məmulatları toxumağı bacarırdılar. Kənddə toxuculuq sənəti yaxşı inkişaf etmişdi, müxtəlif geyim əşyaları ustalıqla toxunurdu. Qadınlar tərəfindən müxtəlif cür, incə zövqlə, geyimə uyğun şəkildə toxunmuş corablar "Ərikli corabları" adı ilə dillər əzbəri idi.

Ərikli kəndi Qarabağ xalçaçılıq məktəbinin xalça məntəqələrindən biri olmuşdur. Burada gözəl Qarabağ xalçaları toxunurdu. Bu günə qədər qorunub saxlanan Qarabağ xalçaçılıq məktəbinin Cəbrayıl qrupuna aid edilən "Qasımuşağı xalçaları" (el arasında "Ağqol gəbə" ("Ağqol xalça"), "Tikmə gəbə" ("Tikmə xalça") adlandırılırdı) Hacısamlı nahiyəsinin Qasımuşağı obasında (indiki Kürdhacı kənd inzibati ərazi vahidində) yerləşən Ərikli kəndində də toxunmuşdur. Kənd sakini Güllü Mustafa qızının (Mustafa Rəhim oğlu) toxuduğu xalça və xalça məmulatları xüsusi ilə fərqlənirdi. Burada "Vərni", "Çələbird" "Qarabağ xalçası", "Atlı, itli xalçaları" və digər xalçalar toxunurdu. Bu gün də toxunmuş belə xalçalar kənd əhalisinin şəxsi kolleksiyasında saxlanmaqdadır.

Kəndin yerləşdiyi ərazi sıx meşəlik olduğundan burada oduncaqdan yanacaq, tikinti materialı kimi istifadə etməklə yanaşı müxtəlif təsərrüfat alətləri və məişət əşyaları hazırlanmasında istifadə edilirdi. Palıd və vələs ağaclarından xarratlar müxtəlif məişət əşyaları hazırlayırdılar. Qab-qacaq, o cümlədən təknə, tabaq, nehrə, cəhrə, çanaq, qollu tərəzi, yun darağı (yun daramaq üçün), hana (xalça, palaz, kilim və s. xalça məmulatları toxumaq üçün), yer hanası (şəddə, örkən toxumaq üçün) və digər belə əşyalar buna misal ola bilər.

Kənd əhalisi sovet hakimiyyəti illərində də milli adət-ənənələrə, milli bayramlara xüsusi diqqət yetirərdilər. "Xıdır Nəbi" oyunları, Novruz bayramı, eləcə də digər bayram və şənlikləri özlərinə məxsus tərzdə qarşılayardılar. Kənddə ən əsas adətlərdən biri – əsasən qış aylarında, uzun gecələrin olduğu bir vaxtda evdar xanımlar toplaşaraq tikmə, hörmə və toxuma işlərini "hov" ("hav", iməcilik) edərək kollektiv şəkildə yerinə yetirərdilər. "Hov" ("hav", iməcilik) yığmaq adəti ot biçinində, tikinti işlərində, bir sözlə bütün ağır işlərdə tətbiq edilirdi.

Soyuducu olmadığı bir dövrdə kənd əhalisi meyvə-tərəvəzi və kənd təsərrüfatı məhsullarını uzun müddət saxlamaq üçün müxtəlif vasitələrdən, o cümlədən quyu və zirzəmilərdən istifadə edirdilər. Bundan əlavə, əhali əvvəllər yay aylarında bu məqsədlə bulaqların yaxınlığında müxtəlif cür qurğular düzəldirdilər. Son dövrlərə qədər yayın isti günlərində ot biçini zamanı qatıq, qarpız, həmçinin digər tez xarab olan ərzaqları soyuq saxlamaq üçün bu vasitələrdən istifadə edilirdi.

Kəndin bağ və bostanları arx vasitəsi ilə suvarılırdı. Son illərdə dəmir və plasmas borularla kəndə su çəkilmişdi.

Dağlarla əhatə olunmuş mənzərəli Ərikli kəndi Ermənistan Silahlı Qüvvələri tərəfindən işğal edilənədək kənddə orta məktəb, kitabxana, tibb məntəqəsi, çörəkbişirmə sexi və mağaza fəaliyyət göstərirdi.

Qasımuşağı obasının digər kəndlərində olduğu kimi Ərikli kəndinin ərazisində öyrənilməyə ehtiyac duyulan bir sıra qədim abidə və kurqanlar mövcud olmuşdur.

**Kəndin təbiəti:** Həyat və insanın bütün təsərrüfat fəaliyyəti müəyyən konkret iqlim şəraitindən asılıdır. İqlim resursları insanın yaşaması üçün əsas təbii faktorlardan sayılır. Saf iqlimi, uca dağları, mənzərəli meşələri, əkinə yararlı sahələri, yaxşı iqtisadi-coğrafi mövqeyi olan ərazilərdən birində, Qasımuşağı obasının sərhədləri daxilində Ərikli adlı bir kənd salınmışdır. Kənd Murovdağın cənubunda, orta dağlıq yamaclarda, respublikanın paytaxtı Bakı şəhərindən şose yolla 510 km qərbdə, rayon mərkəzindən şose yolla 60 km şimal-qərbdə, Kiçik Qafqaz sıra dağlarında, Qarabağ yaylasının cənub-qərb yamacında yerləşir. Xankəndi dəmir yolu stansiyası ilə şose yolla ara məsafəsi 132 km-dir. Şərqdən Şamkənd kəndinin, cənub-şərqdən və cənubdan Kürdhacı kəndinin, qərbdən və şimal-qərbdən Muncuqlu kəndinin, şimaldan Aşağı Qarasaqqal kəndinin ərazisi ilə həmsərhəd olan kənd meşə və axar su kənarında, uca dağlar qoynunda yerləşmişdir. Burada dibi geniş qobular, dərələr, hündür dağlar relyefin əsas formasını təşkil edir. Ərazinin landşaftındakı müxtəliflik, flora və faunanın rəngarəngliyi bu ərazilərdə xüsusi gözəllik yaradır.

Kənd ətrafında enliyarpaqlı meşələr geniş sahələri əhatə edir. Meşələrində çoxlu cır meyvə və giləmeyvələr, çəmənlərində çoxlu dərman bitkiləri bitir. Kəndin meşələrində meşə əmələ gətirən əsas ağac cinslərindən ən geniş yayılanı palıd və vələsdir. Bu ağaclardan kənd binə olan gündən son zamanlara qədər bütün tikinti işlərində, müxtəlif alət və avadanlıqların düzəldilməsində istifadə edilirdi. Ağcaqayın, göyrüş, qarağac, cökə, murdarça, cır meyvələrdən alma, armud, alça, yemişan, qaragilə, əzgil, zoğal, fındıq, həmərsin (itburnu və ya dərgil), zirinc, dovşan alması və s. meyvə ağacları və kolları meşələrin bəzəyidir. Həmişəyaşıl, iynəyarpaqlı, tikanlı ardıc kolları yamacların güney hissəsində daha çox yayılmışdır. Çiyələkli çəmən, yamac və güneylərdə çaşır, baldırğan, kəklikotu, qantəpər, qırxbuğum, qatırquyruğu, andız, quşəppəyi, kənaf, qazayağı, zəyərək, zirə, gicitkən, əvəlik, çobanyastığı, bağayarpağı, ayıdöşəyi, bat-bat, boymadərən və digər bitkilər çəmən, tala və yamacların hakimidir. Bir çox ağac, kol və bitkilərin əksəriyyətindən müəyyən xəstəlikləri müalicə etmək üçün istifadə olunmuş, dərman bitkisi bu yerlərin əhalisinin min dərdinin min bir əlacı olmuşdur.

Təbii şəraitin müxtəlifliyi ilə əlaqədar meşələrdə ağac, kol və bitkilər qədər heyvanlar aləmi də çox rəngarəngdir. Meşələrdə ayı, vaşaq, canavar, çaqqal, tülkü, porsuq, gəlincik, cüyür (əlik), çöl donuzu, dovşan, kirpi və digər heyvanlara rast gəlmək olar. Ekoloji tarazlığın təmin olunmasında va-

cib rol oynayan quşlardan zığ-zığ, qaratoyuq, ağacdələn, şanapipik, cur-cur, bülbül, bayquş, sərçə, qaranquş, qartal, quzğun, qızılquş, qırğı, çobanaldadan, bildirçin, alacəhrə, qırmızıdöş, alabaxta, arıquşu, qarğa, alaqarğa, çalağan, sar və digər quş növləri meşələrin qanadlı sakinləridir.

Kəndin ərazisində hər yerin öz adı var idi. Şəxs adlarına uyğun, coğrafi formasına əsasən, bitki örtüyünə, müxtəlif rəng seçiminə, tutduğu mövqeyə və digər əsaslı səbəblərə əsasən bu adlar babalarımız tərəfindən seçilib adlandırılmışdır. Şanazəryüyürən, Çuxurlar, Araxış, Xaçdaş, Sarıdaş, Göl yeri, Sərt tala (Sərf tələ), Əsədin darı yeri, Göy tap, Qarıqışlağı, Aralıq yurdu, Yaranal, Qoyudqıran, Məşədi Şükürün yurdu, Çınqılın yalı, Qoruq güney, Salmanın dərəsi, Sərt (sərf) güney, Dərviş qaya, Quru göl, Arpa gədiyi, Oyuğun yalı, Dağın talası, Çaşırlı güney, Köhnə pəyə, Atakişinin biçənəyi və digər yer adları məhz bu cür yaranmışdır.

Həkəriçayın bir qolu olan Muncuqlu çayı (el arasında bəzən Qozlu çay kimi adlandırılır) Ərikli kəndinin qərb tərəfindən kənd ərazisinə daxil olur. Ərikli kəndinin qərb sərhədlərini Muncuqlu kəndinin sərhədlərindən ayıran Muncuqlu çayı kənd ərazisinin cənub-qərb tərəfindən Kürdhacı və Muncuqlu kəndlərinin ərazisini bir-birindən ayıran sərhəd boyu, Şəlvə çayına doğru öz yoluna davam edir. Öz mənbəyini kəndin ərazisindəki yüksəkliklərdən başlayan bulaqlar Muncuqlu çayının yatağına qoşulur. İqlim şəraitindən asılı olaraq çay və bulaq sularının həcmi fəsillər üzrə artıb-azalır. Bəzi axar sular yazın axırları və yay aylarında tamam qurusa da, yağıntının miqdarından asılı olaraq yaz və payız fəsillərində öz ərazisini tam bərpa edir.

Zirvəsi daima dumanlı, ağ örpəkli uca dağları, qışda ağappaq, yayda yamyaşıl yorğana bürünmüş meşələri, göz yaşı qədər dumduru suyu olan çayları bulaqlarsız təsəvvür etmək ən böyük günah olardı. Burada fəsillərdən asılı olmayaraq üstü qonaq-qaralı bulaqların hər birinin öz adı, dadı, soyuqluğu və mənzərəsi, şəffaf və saf suyu könül oxşayır. Üçbulaq, Qızılbulaq, Xaçınbulağı və bu kimi bir çox çeşmələr göz oxşayır. Hələ çox-çox əvvəllər, soyuducu olmadığı bir dövrdə əhali bulaqlardan soyuducu kimi istifadə edirdi. Hətta günlərlə qalan məhsul öz keyfiyyətini, təravətini olduğu kimi saxlayırdı.

Bu yerlərin mürəkkəb relyefi, sərt iqlimi bütün amillərə öz təsirini göstərirdi. Burada iqlim yayda sərin, qışda isə soyuq olur. Orta illik temperatur 1°C ilə 8°C arasında dəyişir. Yağıntının illik miqdarı 700-800 mm-ə qədər olur.

**Camaatın ictimai həyatı:** Kənd əhalisi milliyyətcə azərbaycanlılardan ibarətdir. Kənddə yaşayan əhali bir neçə tayfa və tirədən ibarətdir: Heydərli

tayfası (tirələri: Bağıruşağı və Alıbəyuşağı), İbrahimuşağı tayfası, Əhmaduşağı tayfası.

2010-cu il dekabr ayına olan məlumata əsasən, kənd əhalisinin sayı 810 nəfərdir (178 ailə).

Ərikli kənd sakini, XIX yüzilliyin ortalarında yaşamış Mirzalıməmməd İmamverdi oğlu dövrünün savadlı insanlarından biri olmuşdur. Hər hansı bir kəndin ziyalısı haqqında danışanda ilk növbədə həmin kəndin məktəbi haqqında danışmaq lazım gəlir. Ərikli kəndinin ziyalıları, başbilən ağsaqqalları kəndin iqtisadiyyatı ilə yanaşı elmə, təhsilə diqqət yetirmişdilər. Ərikli kəndində ilk dəfə 1930-cu ildə ibtidai məktəb açılmışdır. 1965-1966-cı tədris ilində kənd sakinlərinin təşəbbüsü ilə tikilmiş binada Ərikli kənd səkkizillik natamam orta məktəbi fəaliyyətə başladı.

Sovet dönəmində kənddə ilk ali təhsil almış ziyalı Paşa müəllim (İsgəndərov Paşa Əvəz oğlu) Ərikli kəndində təhsilə olan diqqəti daha da artırdı. Məktəbə direktor təyin edildikdən sonra maarifləndirməni inkişaf etdirmiş, məktəb tipinin dəyişdirilməsi işində böyük əməyi olmuşdur. 1980-1981-ci tədris ilində Ərikli kənd məktəbində yeni siniflərin açılması nəticəsində VIII sinfi bitirən şagirdlər artıq Kürdhacı kənd ümumtəhsil orta məktəbində deyil, Ərikli kənd ümumtəhsil orta məktəbində təhsillərini davam etdirməyə başladılar. Onun faydalı əməyinin təzahür formasıdır ki, bu günə qədər mövcud test üsulu ilə tələbə qəbulu imtahanlarında ixtisas qrupları üzrə ən yüksək nəticə göstərmiş və Azərbaycan Respublikasının ali məktəblərinə daxil olmuş 5 nəfər Ərikli kəndinin gənc sakini Prezident təqaüdünə layiq görülmüşdür.

Azərbaycan Milli Elmlər Akademiyası Nizami adına Ədəbiyyat İnstitutunun dissertantı, tanınmış filoloq, tədqiqatçı-alim Əli Umud oğlu Əliyev bu kənddə anadan olmuşdur.

Keçən əsrin 70-ci illərində öz şeirləri ilə Azərbaycan ədəbiyyatına gəlmiş, Adil Şirin təxəllüsü ilə tanınan şair Şirinov Adil Hümbət oğlu 1955-ci ildə Ərikli kəndində anadan olub.

Kommunistlərin fitvası ilə kollektivləşmə zamanı aparılan repressiya zamanı Ərikli kənd sakinləri müxtəlif çətinliklərlə üzləşdi. 1886-cı ildə anadan olmuş Məhəmmədov Sevindik İsgəndər oğlu 14 yanvar 1938-ci ildə günahsız olduğu halda 52 yaşında güllələnmişdir. Digər kənd sakinləri Miriyev (İmanov) Abduləzim Həşim oğlu, Mehralıyev Bəylər Niftalı oğlu da bu qanlı-qadalı illərin qurbanları oldular.

Ərikli kəndinin sakinləri təkcə elm, sənət yolunda deyil, eyni zamanda bir vətənpərvər kimi hər zaman öndə olmuşlar. Müharibələr tarixində ən dəhşətli və dağıdıcı müharibə – II Dünya Müharibəsi zamanı müharibə işti-

rakçısı olmuş kənd sakinlərindən: Abdullayev Əhəd Hidayət oğlu, Abdullayev Millət Hidayət oğlu, Rəhimov Cümşüd Alıbəy oğlu, Rəhimov Alı Alıbəy oğlu, Rəhimov Əmir Alıbəy oğlu, Məmmədov Məhəmməd İsgəndər oğlu, Məmmədov Məmməd İsgəndər oğlu, Mustafayev Mustafa Hüseyn oğlu, Mustafayev Rəşid Hüseyn oğlu, Mustafayev Məhəmməd Hüseyn oğlu, Abdullayev Abdulla Abdulkərim oğlu, Heydərov Behbud Nəsib oğlu, Miriyev Vəli Aslan oğlu, İlyasov Qiyas Ağamalı oğlu, Mehralıyev Abduləzim Mehralı oğlu, Miriyev Miralı Qasım oğlu, Şükürov Teymur Abbas oğlu, Şirinov Məhəmməd Aslan oğlu, Baxşalıyev Əli Həsən oğlu, Alışanov Həbib İsa oğlu, İsmayılov Ədil Şirin oğlu, Səmədov Ələsgər Mahmud oğlu, Şirinov Xosrov Abdulkərim oğlu müharibəyə yollanmış və bir daha geri dönməmişlər. Sovet dövləti faşizm üzərində qələbə qazandı. Ərikli kəndinin əhalisi bu müharibə zamanı böyük itkilərlə üzləşdi və kənddən müharibəyə gedən igid oğullarından böyük əksəriyyəti geri qayıtmadı. Onlar Vətən uğrunda öz canından belə keçməklə öz hərbi borclarını yerinə yetirmişlər.

Müharibə başlayan gündən son günlərinədək kənddə uşaqlı-böyüklü hər kəs vəziyyətin ağır olmasına baxmayaraq arxa cəbhədə əzmlə çalışır, qələbənin təmin olunması üçün əlindən gələni edirdi. Doğrudur, müharibə sovet xalqının qələbəsi ilə sona çatdı. Kədər və qüssə dolu müharibə illəri arxada qaldı, ancaq əzab və işgəncələr sona yetmədi. Müharibənin ağrı-acısını dadmış, məşəqqətlərə tab gətirmiş, üç oğul itirmiş, ailədə ata soyadını daşıyacaq başıpapaqlısı olmayan ana Məmmədova Hürü Abdulla qızı axirət dünyasına oğulsuz, qohum-əqraba çiynində yola salındı.

İkinci Dünya Müharibəsində faşizm üzərində tarixi qələbənin əldə edilməsində şərəfli döyüş yolu keçmiş digər kənd sakinləri Məmmədov Mürşüd Abdulla oğlu, Abdullayev Mürvət Abdulkərim oğlu, Abdullayev İsmayıl Abdulkərim oğlu, Heydərov Məhəmmədəli Həmid oğlu, Heydərov Musa Həmid oğlu, Heydərov Behbud Nəsib oğlu, Heydərov Misir Nəsib oğlu, Miriyev Alməmməd Rza oğlu, Miriyev Abbas Rza oğlu, Abdullayev Fərman Abbas oğlu, Həşimov Qarakişi Abduləzim oğlu, Həşimov Məhəmməd Abduləzim oğlu, Abdullayev Əli Abbas oğlu, Novruzov Alı Niftalı oğlu, Novruzov Sözalı Möhbalı oğlu, Məmmədov İsmayıl Abdulla oğlu, Zamanov Yunus Mehdi oğlu, Miriyev Əşrəf Qasım oğlu, İsgəndərov Lətif Sevindik oğlu, Məmmədov Qara Sevindik oğlu və digərləri bu müharibənin iştirakçısı olmuş, müxtəlif dərəcədə yaralanmış, xəsarət almış və ya əlil olmuşlar.

Babaların döyüş yolunu davam etdirən, Qarabağ müharibəsi zamanı igid, qorxmaz, cəsur kənd sakinlərindən Çingiz Allahverdi oğlu Şükürov (1973-1994), Ərşad Qara oğlu Sevindikov (1935-1992), Əzizə Alış qızı Hüseynova (1934-1992), Fazil Ayaz oğlu Abdullayev (1958-1992), Güldəstə

Qiyas qızı Ağamalıyeva (1940-1992), Hüseyn İsmayıl oğlu Hüseynov (1934-1992), Xoşbəxt Hüseyn qızı Hüseynova (1963-1992), Məcnun Zaman oğlu Zamanov (1967-1992), Nəsibə Hüseyn qızı Hüseynova (1980-1992), Səadət Şahin qızı Abbasova (1980-1992), Sədaqət Kamran qızı Abbasova (1961-1992), Süsən Hüseyn qızı Hüseynova (1971-1992), Şahin Əli oğlu Abbasov (1951-1992), Vahid Qara oğlu Sevindikov (1934-1991), Yaşar Vahid oğlu Sevindikov (1970-1992), Zöhrab Hüseyn oğlu Hüseynov (1973-1992) şəhidlik zirvəsini fəth etmişlər. Biz inanırıq ki, onların qanı heç vaxt yerdə qalmayacaqdır!

**Əhalinin məşğuliyyəti:** Ərikli kəndi və orada yaşayan əhalinin məşğuliyyəti, güzəranı vaxt və dövrdən asılı olaraq müxtəlif cür dəyişmişdir. Bol suyu, münbit torpağı, zonanın təbii şəraiti, əlverişli iqlimi (kənd ərazisinin dağ-meşə landşaftı zonasında yerləşməsi) olduğundan əhalinin əsas məşğuliyyəti ilkin dövrdən heyvandarlıq və əkinçilik olmuşdur. Heyvandarlıq əvvəlcədən güclü inkişaf edərək əsas aparıcı sahələrdən birinə çevrilmişdir.

Əkinə yararlı sahələrin az olması səbəbindən əkinçilik zəif inkişaf etmişdir. Sovet hakimiyyəti qurulduqdan sonra kolxozlaşma və sovxozlaşma prosesinin başlanması ilə əlaqədar Kürdhacı kəndinin əkinə yararlı torpaq sahələrinin müəyyən hissəsi (Araxış, Çuxurlar və Düzlər adlanan sahənin müəyyən bir hissəsi) Ərikli kəndinə verildi. Bununla da kənddə əkinçiliyin inkişafı daha da sürətləndi. İlin isti dövründə 500-600 mm-ə qədər yağıntı düşməsi və onun da 60-70 faizinin yazda və yayın əvvəllərində yağması dəmyə əkinçiliyi inkişaf etdirməyə imkan verirdi. Əkinə yararlı sahələrdə buğda, arpa, vələmir, pərinc, darı, çovdar və başqa dənli bitkilər becərilmişdir. Təbii ot biçənəkləri burada heyvandarlığın inkişafı üçün əvəzedilməzdir. Heyvandarlıqla məşğul olan əhalinin bir hissəsi yaz gələr-gəlməz Qırxqız yaylağına köç edərdi.

Meşədə bitən cır meyvə və giləmeyvələrdən meyvə qurusu (qax) hazırlanır, müxtəlif məqsədlər (qida, dərman və texniki) üçün istifadə edilirdi. Ənənəvi məşğuliyyətləri maldarlıq olan əhali digər sənətkarlıq növləri ilə də məşğul olurdu. Əkinçilik, dülgərlik, dəmirçilik, bənnalıq, rəngsazlıq, toxuculuq və digər sahələrdə çalışırdılar. Bunlardan toxuculuq çox yaxşı inkişaf etmişdir ki, bu da qoyunçuluğun inkişafı ilə əlaqədardır. Yerli qoyun növlərinin yununun xüsusiyyətlərinə uyğun xalçalar və xalça məmulatları toxunurdu. Kənddə az da olsa ovçuluqla məşğul olanlar var idi. 1940-cı illərin sonu, 1950-ci illərin əvvəlində Azərbaycan Taxta Emalı Sənayesi Laçın Meşə Təsərrüfatı İdarəsinin nəznindəki Hacısamlı Taxta Emalı Zavodu fəaliyyətə başladıqdan sonra taxta-şalban istehsalı da inkişaf etdirilmişdir. Ermənistan Respublikası Silahlı Qüvvələri tərəfindən işğal edildikdən sonra yanacaq və

tikinti materialına, eyni zamanda mebel istehsalı üçün yararlı ağaclar qırılaraq Ermənistana daşınır və oradan da müxtəlif yollarla digər ölkələrə satılır.

1992-ci ilin may ayının 18-i günü Laçın şəhərinin Ermənistan Respublikası Silahlı Qüvvələri tərəfindən işğal edilməsi ilə əlaqədar bütün kommunikasiya xətlərinin kəsilməsinə baxmayaraq Ərikli kəndi 29 may 1992-ci il tarixə qədər müdafiə olunmuşdur. İşğal zamanı ətraf kəndlərdə olduğu kimi Əriklidə olan yaşayış evlərinin əksəriyyəti yandırıldı. Bir müddət sonra Azərbaycan Silahlı Qüvvələri tərəfindən azad edilən Ərikli kəndində yaşayış yenidən bərpa edilmişdir. Kənddə Ərikli qərargahı yaradılmışdır. Kəlbəcər rayonunun ərazisindən yeni kommunikasiya xətləri çəkilmişdir. Yaradılmış rabitə şöbəsi vasitəsi ilə ətraf kəndlərlə əlaqə yaradılırdı. Kəlbəcər rayonunun ərazisindən keçməklə Ərikli – Bakı marşrutu ilə işləyən avtobus xətti işə salınmışdır. 1992-ci ilin payızında Ərikli kənd orta məktəbi öz fəaliyyətini yenidən bərpa etdi. Quraşdırılmış yeni transformator Ərikli kəndi də daxil olmaqla ətraf kəndləri də işıqlandırırdı. Ancaq bütün bunlar uzun sürmədi. 2-3 aprel 1993-cü il tarixdə Kəlbəcər rayonunun Ermənistan Respublikası Silahlı Qüvvələri tərəfindən işğalından sonra mühasirədə qalan kənd sakinləri məcburən kəndi tərk etdilər. Bu kənddən olan məcburi köçkünlər indi Azərbaycanın müxtəlif bölgələrində məskunlaşıblar.

Erməni tapdağı altında qalmış Ərikli kəndinin zəhmətkeş əhalisi Qarabağ müharibəsi başlandıqdan sonra bir daha pərən-pərən düşmüş, Vətən həsrəti ilə qərib ellərdə məcburi köçkünlük həyatı yaşayırlar. Bir çox qəlbi kövrək insanlar bu dərdə dözməyib dünyasını dəyişmişlər.

Kənd sakinləri bu gün ancaq xeyir-şər mərasimlərində bir-biri ilə görüşür, dərdləşir. Elə bu səbəbdən də kəndin qədim adət-ənənələri, mədəniyyəti, davranışları və digər özünəməxsus xüsusiyyətləri itib-batmaq, unudulmaq üzrədir. Çox təəssüf...!

Kaş erməni əsirliyində girov qalan, hər bir sakini üçün qəribsəyib darıxan Ərikli kəndinin şən, hay-küylü, son dərəcə rəngarəng keçmiş günləri yenidən geriyə qaytarılaydı.

Və sonda mən inanıram ki, o gün gələcək, işğal altındakı bütün ərazilərimiz düşmən tapdağından azad ediləcək, biz o yerlərə bir daha geri dönəcəyik!



**Sultan HÜMBƏTOV**

**POEZİYA**



## PƏNAH MİKAYILOV

Pənah Abduləli oğlu Mikayılov 10 may 1935-ci ildə Laçın rayonunun Qoşasu kəndində müəllim ailəsində anadan olmuşdur. 1953-cü ildə Laçın Pedaqoji Texnikumuna daxil olmuş və oranı 1955-ci ildə fərqlənmə diplomu ilə bitirmişdir. Həmin ildən Kəlbəcər rayonunun Kilsə kənd ibtidai məktəbində müəllim kimi fəaliyyətə başlamışdır. Sonra müəllimlik fəaliyyətini Laçın rayonunun Daşlı, Vəlibəyli, Narışlar və Qoşasu kənd məktəblərində davam etdirmişdir. Pənah Mikayılov 1966-ci ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinə (indiki BDU) daxil olmuş, 1972-ci ildə həmin universitetin filologiya fakültəsini müvəffəqiyyətlə bitirmişdir. Universiteti bitirdikdən sonra "Aşıq Şəmşirin həyat və yaradıcılığı" mövzusu üzərində işləmiş, lakin müxtəlif problemlər üzündən dissertasiya işini müdafiə edə bilməmişdir.

Pənah Mikayılovun şeirləri müxtəlif qəzet və jurnallarda dərc edilmişdir. Laçının işğalından sonra Sumqayıtda məskunlaşmış, pedaqoji fəaliyyətini Laçın rayon 5 saylı orta məktəbində davam etdirmişdir. 45 illik səmərəli pedaqoji əmək fəaliyyəti olan Pənah Mikayılov müxtəlif "Fəxri Fərman"larla, Respubilkanın "Qabaqcıl maarif xadimi" fəxri adı ilə təltif edilmişdir. Yüksək pedaqoji ustalığa malik olan Pənah müəllim 1994-cü ildə Azərbaycan Respulikası Təhsil Nazirliyinin Komissyasının qərarı ilə "Ali kateqoriyalı müəllim" adına layiq görülmüşdür. Bütün qaçqın ziyalılar kimi Pənah müəllimin də həyatında qaçqınlıq dövrü silinməz qara izlər buraxmışdır. Vətən həsrəti, torpaq nisgili, yurd möhnəti nəcib duyğular sahibi Pənah müəllimin kövrək şair qəlbini şam kimi damla-damla əritdi. O, 1998-ci ilin mayında Sumqayıt şəhərində əbədiyyətə qovuşdu. Şarin "Vətən həsrətli ömür" adlı kitabı ölümündən bir bir il sonra, 1999-cu ildə "Sumqayıt" nəşriyyatında çapdan çıxıb.

## GƏLMİŞƏM

Doğma kəndimizdən ayrılan zaman,
Bağrımın başını oyub gəlmişəm.
Babamın, nənəmin ulu məzarın
Sahibsiz, kimsəsiz qoyub gəlmişəm.

Qəlbimdə qəmi var hər ötən günün,
Həsrətin çəkirəm dumanın-çənin.
Gələndə Ərgahın, Qabaqtəpənin
Bir ovuc torpağın yeyib gəlmişəm.

Dağlara tapşırıb güc-qüvvətimi,
Yazdım zirvələrə qəm möhnətimi.
İçib bulaqlardan son qismətimi,
Zildən bir bayatı deyib gəlmişəm.

O tərlan bəxtimiz düşəndə tora,
Namus da, qeyrət də gəlmədi kara.
Viranə qapımda o xan çinara
Vəsiyyət sözümü deyib gəlmişəm.

Varımız, mülkümüz yağıya çatdı,
Bəxtəvər ömrümüz Laçınla bitdi.
Görəndə ömürlük Qoşasu getdi,
Cüt əlli başıma döyüb gəlmişəm.

Bağçamda gülləri qoxdum, doymadım,
Qarışıb sellərə axdım, doymadım.
Qırxqız cilvələndi, baxdım doymadım,
Pənah, kim deyir ki doyub gəlmişəm?!

## VAR

Qurşanma insafsız zalım vərdişə,
Öyünmə, nəzər sal çərxi-gərdişə.
Ömür dedikləri bir büllur şüşə,
Onun daşa dəyib sınmağı da var.

Lağ etmə təpəyə çıxanda dağa,
Lovğalar zirvədən enər aşağa.
Çox da bel bağlama yanar çırağa,
Qəfildən qaralıb sönməyi də var.

Hörmət qoymalıdı insana insan,
Dəyib könüllərə etmə pərişan.
Bəxtin gətirəndə eyləmə tüğyan,
Talenin üzünün dönməyi də var.

Mərifət bazarda deyil ki satın,
Namərd al-ver ilə ucalda zatın.
Pənah, kim tapdasa haqqın baratın,
Elin qarşısında dinməyi də var...

***Laçın, 1985-ci il***



**QARABAĞ QAZİLƏRİ**

## VƏTƏNİN DAR GÜNÜNDƏ

Adətən Vətən dar günlərində igid və mərd oğullarına güvənir. Buna görə də el deyimində "oğul düşmən çəpəridir" demişlər. Tarixlərdən üzü bəri Azərbaycanın say-seçmə igid ərənləri düşmənlərimizin bağrını dəlmiş, yuxularına haram qatmışlar. Öz sərkərdəlik, döyüşçülük bacarıq və qabiliyyətləri ilə həmişə hər yerdə seçilib fərqlənmişlər. Belə fərqlənmələrdə haradasa irsi və genetik xüsusiyyətlər də özünü göstərir.



Belə bir genetik xüsusiyyəti özündə yaşadan, Qarabağ müharibəsində Vətən torpaqlarının azadlığı uğrunda döyüşmüş, sağlamlığını itirmiş şəxslərdən biri də Salahov İlhami Hüseyn oğludur. İlhami Laçın rayonunun Şəlvə kəndində zəhmətkeş bir ailədə anadan olmuşdur. Tale, qismət elə gətirmişdir ki, İlhaminin babası, Şəlvə dərəsində mərdliyi, igidliyi, səxavəti ilə sayılıb-seçilən Qələndər oğlu Kərim də öz dövründə erməni azğınları ilə döyüşlərdə igidliklər göstərmişdir. Həm kəşfiyyatçı, həm də döyüşçü kimi Qələndər oğlu Kərimin erməni-müsəlman savaşında – "Zabux əməliyyatı" və "Keçəldağ" döyüşlərində xüsusi şücaətləri olmuşdur.

Bəli, bu tarixi yolun davamçısı olan İlhami də öz şücaətini torpaqlarımız uğrunda gedən döyüşlərdə ermənilərə kifayət qədər göstərmişdir. 1992-

ci ildə Vətənin ağır günlərində istehsalatda işini dayandırıb torpağın müdafiəsinə – döyüşə yollanmışdır. Füzuli, Beyləqan və Cəbrayıl bölgələrində ağır döyüş əməliyyatlarının iştirakçısı olmuşdur. Vətənin hər qarış torpağı döyüşçülərin ölüm-dirim məsələsi idi. Gərgin döyüşlərin birində başından güllə yarası aldı. Ölümlə pəncələşən İlhaminin baş sümüyündə ilişib qalmış mərminin çıxarılması oradakı tibbi şəraitin imkanı xarincində olduğu üçün təcili Bakı şəhərinə gətirildi. Burada ağır əməliyyat olundu. O vaxt “Semaşko” xəstəxanasında çalışan həkimlərimizin peşəkarlığı və əzmkarlığı nəticəsində İlhami həyata qaytarıldı. Sağ olsun bizim həkimlərimiz də. Əsgərlərimiz cəbhədə döyüşdükləri kimi həkimlər də öz “cəbhələrində” döyüşçülərdən geri qalmayaraq şücaətlər göstərirdilər. O vaxtlar hər kəs öz cəbhəsinin əsgəri idi. Mən xəstəxanaya dayım İlhamiyə baş çəkməyə gedəndə onu tanınmaz bir vəziyyətdə gördüm. Dayım saç-saqqalın içində idi. Sanki bu müharibənin odu-alovu onu yandırıb qovurmuşdu. Əllərinə baxdım, sağ əli normal idi, o biri əlinin içərisi isə yanaraq qaysaq bağlamışdı. Həmin əlinin barmaqlarını bir yerə qatlaya bilmirdi. Bir müddət sağlığı bərpa olandan sonra mənə məlum oldu ki, bu döyüşlərdə işlətdiyi silahın qaz borusundakı alt hissənin qızmasından olan fəsaddır. Belə ki, ağır və iriçaplı olmasına görə bu silahın atan zaman yerə qoyub dirəcək kimi istifadəsi üçün çarpaz iki ayağı vardır. Gərgin və dəyişkən döyüşlərdə silahın bu dayaqlarından istifadənin mümkün olmadığı üçün İlhami daima sol əlinin içərisində tutub atırmış. İlhaminin özü isə bu vəziyyətin həmişə təkrarlandığını xatırlayaraq “mən sol əlimi artıq hiss etmirdim, ondan kötük kimi istifadə edirdim” – deyirdi.

Yaraları tam sağalmamış yenidən ön cəbhəyə-döyüşə yollanan İlhami Salahov atəşkəs sazişi (8 may 1994) bağlanana qədər Vətənin müdafiəsi üçün döyüşdü.

Bəli, Qarabağ müharibəsi İlhaminin sağlıq durumunda fəsadlar dolu bir iz qoydu. Bu qaysaqlar və yaralar qismən də olsa müalicə olundu. Ancaq onun daxilində və xatirələrində olan qaysaqları o, indi də özü ilə yaşadır.

Biz İlhami dayımızla daima fəxr edirik. Mən bu yazıda Qarabağ müharibəsində İlhaminin keçdiyi döyüş yolunun ancaq bir səhifəsini qeyd etdim. Onun vətənpərvərliyi və yaşadığı həyat yolu bu gün də bizlər üçün nümunə və örnək ola biləcək bir məktəbdir.

**Xalid BAHADUROĞLU**

**NƏSR**

# PELE ÖKÜZÜN ƏHVALATI

***Bu əhvalatı ruhlarına rəhmət atamın bacısı Abidə qarı (Əsl adı Tamaşa olsa da, hamı onu Abidə çağırıb) danışıb. Yazıda həm də babam – Hərbi Yunkerlər Məktəbinin məzunu kapitan Abdulla Mirzə oğlu Nəbiyevin əziz xatirəsinə dərin hörmətimi bildirirəm. Onu da deyim ki, bu əhvalat XX əsrin 20-ci illərində doğma kəndim Mişnidə baş verib.***

Balaca Abidə taleyin ona verdiyi acı günlərini yaşayırdı. Anasını yenicə itirmiş bu qızcığaz hələ yetimliyin nə olduğunu dərk edə bilmirdi. Onun hələ ki, təsəllisi atasının başına tumar çəkərək danışdığı nağıllar, nənəsinin “can bala!” deyərək göstərdiyi nəvazişlər idi. Dünyadan xəbərsiz olan bu qızcığaz arıq vücudu ilə dövrün aclıq və səfalətlə dolu astanasında idi. Hərbçi atasının işi və ziyalılığı onun həyatı üçün təminat idi. Lakin atasının işi ilə əlaqədar aylarla evdən ayrılması Abidə üçün çox darıxdırıcı olurdu.

Yaşadıqları kiçik ev balaca Abidə üçün böyük bir dünya idi. Hər dəfə atası doğma Mişni kəndindən ayrılıb hərb evinə dönəndə, Abidə nənəsinin evində qalmalı olar və evləri üçün çox qəribsəyərdi. Çox darıxanda qaçıb babasının düzəltdiyi samanla dolu axurda üzüqoylu uzanar, doyunca ağlayar və elə oradaca şirin yuxulara dalardı. Bu zaman saman çöpləri onun günlərlə daranmayan saçlarına dolaşar, hər dəfə də nənəsi deyinə-deyinə saman çöplərini artlayardı.

Abidənin başında yalnız bir fikir dolaşardı – atası tez qayıtsın, macəralarla dolu nağıllarını danışsın, bu nağıllardakı qəhrəmanların xəyalları ilə çoxlarının həsəd apardıqları o şirin yuxuları yatsın. Beləcə günlər ötüb keçirdi...

Bir gün kəndə xəbər yayıldı ki, qonşu kəndlərin birində dünyasını dəyişmiş bir kişi dəfn olunub, ancaq səhəri gün yaxınları qəbir üstünə gedəndə görüblər ki, qəbir bomboşdur. Bu xəbər kəndə yayılar-yayılmaz hamı qorxu içində kəndin xırmanına yığıldı. Uşaqlar qorxudan titrəyir, arvadlar həyəcan və təlaşla pıçıldaşır, kişilər isə bu işin necə baş verdiyi barədə əlli fikir yürüdürdülər. Axırı belə qərara gəldilər ki, yəqin kişi xortdayıb qaçıb. Beləcə hər kəs birinin üstünə beşini də qoyub neçə cür şayiələr yaydılar.

Elə bu vaxt, axşam düşəndə balaca Abidənin atası Abdulla hərbi geyimdə kəndə çatdı. Bu əhvalatı da kəndin girəcəyində eşitdi. Danışılan şayiələrə yalnız gülümsəyib başını buladı və evinə yollandı. Hamıdan çox sevinən balaca Abidə oldu. Bu əhvalatı eşidəndən sonra nənəsinin yanında çox qorxurdu. Atasının gəlişi isə bunları ona unutdurdu. Axı atası yanında olanda o, heç nədən qorxmurdu. Əksinə, istəyirdi ki, atası nağıllarını tez başlasın.

Atası yorğunluğuna baxmayaraq, az da olsa nağıl söylədi və qızının yuxuya getməsinə baxıb kövrəldi.

Elə ki, gecə yarı oldu, birdən qapının asta-asta döyülməsi Abdullanı oyatdı. Qapını açdıqda qonşu kişilərdən birini qapıda təlaş içində gördü. Qonşu həyəcanla dedi:

– Avdılla qaqa, Avdılla qaqa, bə yatmısan? Ə, bə dünyadan xəbərin yoxdu?

Abdulla təmkinlə cavab verdi:

– A kişi, nə xəbərdi belə?

Qonşu:

– Ə, mürgüdən təzə yuxuya getmişdim ki, baxdım dəhlizdən hənirti gəlir. Durub nə görsəm yaxşıdır? Gördüm ki, “xortdamış kişi” gəlib çıxıb bizim evə, başını salıb dəhlizdə arpa yığdığımız kəndidə arpa yeyir. Yol tapıb çıxa bilmədim. Hananın böyür ağaclarını bacaya söykəyib birtəhər bacadan çıxa bildim. Özü də kişinin buynuzu və quyruğu da var, yaman da bədheybətdi. Öküz kimi kişidi. Hamıya xəbər verdim, hər kəs ordadı.

Abdulla:

– Əşi, ağ eləmə, bu boyda zarafat olar?

Lakin qonşu kişinin incik sifətini çıraq işığında görər-görməz Abdulla hər ehtimala görə xəncərini də götürüb evdən çıxdı.

Hamı “xortdamış kişi”nin girdiyi evin qabağına yığışmışdı. Heç kim cürət edib yaxınlaşa bilmirdi. Abdulla dəhlizin yuxarı başına keçdi, baxdıqda qaranlıqda bir öküzün başını kəndiyə saldığını gördü. Bildi ki, öküz kəndidə taxıldan, dəndən tapıb yeyir. Ağlına gəldi ki, bu, Pele öküzün işi olacaq. Əlindəki ağacla öküzün belinə bir-iki dəfə çəkib öküzü çıxartmaq istədi. Dəhliz dar, öküz də ki, maşallah, taxıldan, dəndən yeyib daha da ağırlaşmış, daha da harınlamış. Heyvanı ancaq ehtiyatla çıxartmaq lazım idi ki, hürküb aləmi bir-birinə qatmasın. Abdulla nə qədər çalışdısa da qapıda duranların heç biri qorxusundan köməyə gəlmədi. Axır ki, Abdulla birtəhər öküzü bayıra çıxara bildi. Öküz öküz kimi olsa da, qorxudan bilmədi hara təzib getsin.

Sizə kimdən deyim – qapıda intizarla gözləyən kənd əhlindən: ürəyi gedən kim, vay-şivən qoparan kim, əlinə dəmir götürüb döyəcləyən kim. Aləm qarışmışdı bir-birinə. Abdulla nə qədər çalışdısa da camaatı inandıra bilmədi ki, bu bir adi öküzdür. Gördü ki, səhərə az qalıb, yadına düşdü ki, balaca qızı Abidə indi bəlkə də qorxu içində hələ də yatmayıb. Evə döndü. Balaca Abidənin qorxudan hələ də titrədiyini görüb onu nənəsinin qucağından aldı və sakitləşdirdi. Ata-bala birlikdə yuxuya daldılar.

Səhər erkən yenə hay-küy, yenə qonşunun təlaşlı səsi ata-balanı yuxudan oyatdı.

-Avdılla, ay Avdılla, çıx çölə görək! Deyillər, “xortdamış kişi” dərədə can verir, özü də elə öküz dərisində. Ə, qılıncdan, tüfəngdən də götür.

Abdulla “Allah, mənə səbir ver!” deyib qılıncını götürdü, dərəyə endi. Təxmin etdiyi kimi idi. Oğurluqda məşhur olan, camaatın taxıl-dəninə, ot tayalarına qənim kəsilən, elə bu oğurluqların birində də buynuzunun birini bada verən, bununla da buynuzuna pəl qoyaraq el arasında “Pele” adına sahib çıxan Pele öküzüdü can verən. Arpa və buğdadan yeyib o ki var sudan içən öküz el arasında desək, “partlamaya” düşmüşdü.

Abdulla gördü ki, öküz haram olacaq, tez xəncərini çıxarıb Pele öküzün başına çəkdi. Pele öküz oğurluğunun güdazına getdi. Elə bu vaxt öküzün sahibi gəlib çıxdı. Vay-şivən qopardı ki, bəs bu gecə Pele öküz Kəvşəndə yer şumlayarkən cütü qırıb qaçıb. Ancaq camaatdan “əhvalat”ı eşitdikdə hamı kimi o da inandı ki, “xortdamış kişi”nin ruhu öküzün canına keçib .

Pele öküzü soyub ətini paylaşmaq lazım idi. Ancaq heç kim yaxın gəlib öküzü soymaqda Abdullaya kömək etmədi. Öküzün canına ruhun keçməsinə artıq hamı inanmışdı. İnanmayan bir Abdulla idi, bir də kəndin bir-iki ziyalısı. Camaat “xortdamış kişi”nin ruhundan uzaq olan adi bir öküzün ətinin heç yaxınına da gələ bilmədilər. İnandırmağın mənasız olduğunu gördükdə, Abdulla camaatı inandırmaq fikrindən vaz keçdi. Xəncəri çıxarıb öküzün bir hissəsini soyub ətinin yaxşı yerindən kəsib çıxardı və evə gətirib ocaq qaladı. Şişləri hazırlayıb kababdan çəkdi. Qaynanası yeməsə də balaca Abidə ilə kababı dişlərinə çəkib ləzzətlə yedilər. O boyda Pele öküzün ətinin qalanı dərədə qurd-quşa yem oldu.

Bu əhvalatın xofundan çıxmayan kənd əhli isə bir müddət səksəkə içində yaşadı.

Soruşacaqsınız ki, “xortdamış kişi” əhvalatı nə idi? Yadınızda saxlayın! Bu dünyada iki sevda çəkənlərin cəzası çox ağır olur. Ailə quranda ehtiyatlı olun ki, ikinci arvada sahib olub cəzanızı o dünyada da çəkməyəsiz, arvadların davası məzarınızı qazdırar da, hələ başqa yerə köçürər də, heç kimin xəbəri olmaz da.



Bu da Pele öküzün əhvalatı. Qonşu kənddəki “xortdamış kişi”nin vaxtı ilə iki sevda çəkməsinin düşmənçiliyi Pele öküzün başında çatladı, Pele öküzə bir “pəl” də belə qoyuldu.

**Venera MİRZƏYEVA,**
***Laçın rayon 7 saylı tam orta məktəbin riyaziyyat və informatika müəllimi***

SƏNƏTÇİLƏRİMİZ

## AŞIQ ADİL CƏFAKEŞ



Aşıq Adil Cəfakeşi mən ilk dəfə radio verilişlərindən tanımışam. Səhv etmirəmsə, onun haqqında ilk verilişi Elxan Məmmədlinin "Sarıtel"ində eşitmişəm. Elə o vaxtdan da bu aşığın sazına-sözünə vurulmuşam. Təsadüfən bir dəfə Azərbaycan Dövlət Televiziya və Radio Verilişləri Qapalı Səhmdar Cəmiyyətində radio binasının qabağında Adil Cəfakeşlə rastlaşdım. Qısa söhbətdən sonra mən onu "Divani" saz-söz məclisi" verilişinə dəvət etdim. Onun ifa etdiyi qədim saz havaları, xoş söhbəti dinləyiciləri heyran etdiyindən mən aşıqla daha bir neçə veriliş aparmalı oldum. Beləcə aramızda dostluq əlaqələri yarandı.

Adil Cəfakeş 1966-cı ildə Laçın bölgəsinin Şeylanlı kəndində dünyaya gəlib. O, Şuşa Kənd Təsərrüfatı Texnikumunu bitirsə də, hələ uşaq yaşlarından saza-sözə könül verib. Bu el sənətkarının indiyə qədər iki kitabı ("Bir ağı de, ay ana", "Yolçu, hara gedirsən") işıq üzü görüb. Adil Cəfakeş həm də Azərbaycan Yazıçılar Birliyinin üzvüdür.

Adil Cəfakeş aşıqlığı öz həmkəndlisi Mehbalıdan öyrənib. Mehbalı qədim havalara, Qarabağın ustad aşıqlarına yaxşı bələd bir sənətkardı. Adil Cəfakeş "Ağbaba gülü", "Sarıtorpaq", "Zəngəzur gözəlləməsi", "Dərvişi", "Dərbəndi" kimi saz havalarını ustadından əxz edib. Mehbalı təxminən 61 yaşında, 1992-ci ilin mayında Laçının işğalı zamanı itkin düşüb.

Adil Cəfakeş həm yaradıcı aşıq, həm sazbənddir. Musiqi duyumu qüvvətli olduğundan bir neçə saz havası da yaradıb. O, yaşı çox olmasa da, Qarabağ aşıq mühitinin Laçın qolunu təmsil edən ustad aşıqlar haqqında kifayət qədər bilgiyə malikdir. Məsələn, mən onun vasitəsilə ilk dəfə Aşıq Səlim, Aşıq Cəfərqulu, Aşıq Ələmşah və başqaları haqqında az-çox məlumat əldə etmişəm. Yəni Mehbalının ustadı öz babası Aşıq Səlim, onun ustadı isə Aşıq Cəfərqulu olub. Aşıq Cəfərqulunun yaratdığı bir neçə saz havası ("Zəngəzur gözəlləməsi", "Sarıtorpaq") dövrümüzə qədər gəlib çatıb. Aşıq Adil Cəfakeşin dediyinə görə, bu havalardan "Sarıtorpaq"a bəzən "Sarıqaya" da deyirlər. Onu da qeyd edim ki, Aşıq Cəfərqulunun ustadı Laçının Kamallı kəndindən olan Aşıq Ələmşahdır. Deyilənə görə, Aşıq Ələmşah çox təbli aşıq olub. O, Aşıq Ələsgərlə dostluq eləyib. Təəssüflər ki, bu ustad aşığın yaradıcılığı vaxtında toplanıb yazıya alınmadığından itib-bat-

mışdır. Bu el sənətkarından dövrümüzə bir yadigar hava ("Ağbaba gülü") qalıb. Bu hava haqqında bir rəvayət bu günlərə qədər laçınlılar arasında dolaşmaqdadır. Rəvayətə görə, bu saz havası Ağbaba dağının ətəyində yaradılmışdır.

Aşıq Ələmşahın ustadı isə Aşıq Həşimdir. Bu sənətkar da zəngin yaradıcılığa malik olsa da, onun ədəbi irsindən heç nə qalmamışdır.

Bu deyilənlərdən sonra Adil Cəfakeşin sənət şəcərəsində yerini də müəyyənləşdirdim:

Aşıq Həşim → Aşıq Ələmşah → Aşıq Cəfərqulu → Aşıq Səlim → Mehbalı → Adil Cəfakeş.

Adil Cəfakeşin Təşəkkül Əmrəliyev, Rəfael Alməmmədov, Nasir Alxasov, Ağa Quliyev kimi istedadlı şəyirdləri var. Yəni aşıq ustad-şəyird ənənələrini davam etdirir.

Sevindirici hadisədir ki, bu yaxınlarda AMEA Folklor İnstitutunun buraxdığı "Qarabağ musiqi folkloru" (xalq mahnıları, təsnif və rəqslər) diskində Adil Cəfakeş və onun şəyirdi Təşəkkül Əmrəliyevin ifalarında iki qədim saz havası ("Ağbaba gülü", "Zəngəzur gözəlləməsi") yazıya alınmışdır.



Adil Cəfakeş hazırda Laçın rayon Şəlvə kənd uşaq musiqi məktəbində sazdan dərs deyir. Balalarımıza sazın sirlərini öyrədir. Mən Adil Cəfakeşə yeni-yeni uğurlar arzulayıram.

**Tacir SƏMİMİ,**
***AMEA Folklor İnstitutunun böyük elmi işçisi,***
***filologiya üzrə fəlsəfə doktoru***

**KİTAB RƏFİ**




### "SƏN YANIMDA OLMAYANDA"

Bu kitab istedadlı şairə Bənövşə Daşdılının sayca dördüncü kitabıdır. Kitabda müxtəlif zövqlü oxucular üçün poetik nümunələr toplanmışdır. Bənövşə xanımın yaradıcılığı gözəl Qarabağ torpağında bacarıqlı bağban tərəfindən becərilən bağa bənzəyir. Münbit torpaqda becərilən bağda hər cür meyvə olduğu kimi, Bənövşə xanımın yaradıcılığında da hər mövzu var.

**POEZİYA**

**Allahverdi ƏLİYEV,**
*Vağazinli el şairi*

## DAĞLAR YAMAN GÜNDƏDİ

***«Məğrur duran o dağlardan nə xəbər» misralı şeirin müəllifi Şahmar Əkbərzadənin xatirəsinə***

Sən gördüyün o dağları çən alıb,
Dərd əridib, kədər üzüb, qəm alıb.
Bu on ildə bəlkə yüz il qocalıb,
Dağlar qalıb ağlar, yaman gündədi,
Əkbərzadə, dağlar yaman gündədi.

Bulud alıb göylərinin üzünü,
Kol-kos basıb cığırını, izini.
Çamur tutub çeşmələrin gözünü,
Lilparları dodaq üçün təşnədi,
Əkbərzadə, dağlar yaman gündədi.

Yaylağında qarı düşmən yurd salıb,
Oylaqları qarğa, quzğun, sar alıb.
Yad nəfəsdən yal-yamaclar saralıb,
Qarsalanıb bağlar, yaman gündədi,
Əkbərzadə, dağlar yaman gündədi.

Qayaları naxışlanıb güllədən,
Qartalları ayrı düşüb zirvədən.
Nigaransan Mıxtökəndən, Şəlvədən,
Həsrətinin yeri yaman göynədi,
Əkbərzadə, dağlar yaman gündədi.

Dəlidağın üzdən düşdü rübəndi,
Qırxqız gördü, həyasından üşəndi.
Sarıbaba-qəşənglərin qəşəngi
Bir ah çəkdi, için-için inlədi,
Əkbərzadə, dağlar yaman gündədi.

Yaman çöndü bu yerlərin növrağı,
Gəlmir daha Damcılının qonağı.
Cıdır düzüm yadellilər tapdağı,
Qeyrətimiz oyanmadı, dinmədi,
Əkbərzadə, dağlar yaman gündədi.

Yurd-yuvadan perik düşdü bu ellər,
Viran oldu Laçın, Şuşa, Kəlbəcər.
Yuxumuzda Vətən gördük gecələr,
Yuvasızlar bilir Vətən, yurd nədi,
Əkbərzadə, dağlar yaman gündədi.

Namərd oğul ucuz satdı dağları,
Meşələri, ormanları, bağları.
Ömrümüzün qoca, ahıl çağları
Ürəyimiz vərəmlədi, simlədi,
Əkbərzadə, dağlar yaman gündədi.

Yuxu imiş o bəxtəvər anlarım,
Şaxta vurub, çiçəklənməz baharım.
Yaxınlarım, uzaqlarım, yadlarım,
Oymaqların gözü səndə, məndədi,
Əkbərzadə, dağlar yaman gündədi.

***Təqdim etdi:***
**Fəxrəddin ŞAHSUVAROV**

**ELLƏRİMİZ**

# QASIMUŞAĞI TAYFASI

Hər sətrində bir elin, bir mahalın, böyük Vətənimizin kiçik hissəsi hesab olunan, əslində isə hər birimiz üçün daha böyük və sevimli hesab etdiyimiz, hər cığırında ayaq izimiz qalan obaların, bu obalarda gün-güzəran keçirən tayfaların oxunmamış neçə-neçə gizli tarixi var. Min bir əzab-əziyyətlə toplanmış, misralanmış, sətirlərdə sıralanmış bu mətn bir böyük elin – tayfanın tarixi, müqəddəs ruhları qarşısında hər zaman borclu qaldığımız ulu baba və nənələrimizin, eləcə də şəhidlərimizin şərəfli ömür yoludur.

Avropalaşmanın vüsət aldığı bir vaxtda milli-mənəvi dəyərləri və özünəməxsusluğu qoruyub saxlamaq getdikcə daha da çətinləşir. Milli ruhun, milli mentalitetin qorunub saxlanılması, həmçinin xalqımızın etnogenezisinin müxtəlif aspektləri, ayrı-ayrı tayfaların, yaşayış məntəqələrinin adlarının mənası, tayfaların yayılma arealının müəyyənləşdirilməsi işinə bizlərin hər biri yardımçı olmalıyıq.

Qeyd edək ki, Azərbaycanda ən qədim kökə malik olan tayfaların tarixi barədə bu günə qədər müfəssəl bir məlumatın olmaması üzündən hər zaman gənc nəsil bir çox həqiqətləri öyrənməkdən məhrum olmuşdur. Bu tayfaların yaşadıqları ərazilər daima döyüş meydanı, mübarizə meydanı olmuş, onlar belə döyüşlərə, belə hücumlara dəfələrlə məruz qalsalar da, mərdi-mərdanə bu hücumlara sinə gərmişlər. Talan-qarət olunan el-obalar, qəbilə-tayfalar tarixin süzgəcindən alnıaçıq, illərin sınağından üzüağ çıxmış, tarixini, mədəniyyətini, adət-ənənəsini, dilini, əsil-kökünü qoruyub saxlamışdır. Zaman-zaman qaim-qədim tayfalar haqqında olan gerçək məlumatlar nə qədər təhrif olunsa da, sonda tayfa üzvləri tayfalar haqqında gerçək məlumatı qoruyub saxlamış, nəsildən-nəsilə ötürmüşlər.

Tariximizi yaşlı nəslin – ağsaqqal və ağbirçəklərin söhbətlərinə qulaq asa-asa öyrənməyə çalışırıq. Ata-babalar yeni nəslə "hər bir kəs yeddi arxadönənini tanımalıdır" ideyasını unutmamağı tapşırsa da son dövrlər bu fikir tam unudulmuş və az qala tamamilə yaddan çıxmışdır. Əgər bu ideya xatırlanarsa, bax, həmin an hər birimizin qarşısında belə bir sual durar: "Mənim ulu babam, ulu nənəm kimdir, qohum-əqrabalarım kimdir, köküm, əcdadım kimlərdəndir, axı mən kiməm?".

Hələ uşaq olarkən bu növ sualları yaşlı nəslin nümayəndələrinə – ağsaqqal və ağbirçəklərə ünvanlayan zaman onlar "Biz Təkə-Türkmanıq, bala" – deyə cavab verərdilər. Çar və Sovet Rusiyası dönəmində qəsdən kimliyimiz araşdırılmamış, təhrif edilən bu cür mövzular istiqamətində araşdırmalar aparılması mümkün olmamış və yaxud da buna icazə belə verilməmişdir. Bu

gün isə bu mövzunu araşdırmaq üçün olduqca əlverişli şərait yaransa da bugünkü nəsil üçün bu iş bir xeyli çətinləşib. Buna səbəb isə murdar xislətli erməni qonşularımızın Azərbaycana və azərbaycanlılara qarşı apardığı müharibə nəticəsində öz daimi yaşayış yerindən dərbədər (didərginmi deyim, məcburi köçkünmü çağırım? – söyləməyə dilim də gəlmir!) salınmasıdır.

Mənbələrin müqayisəli təhlili göstərir ki, "təkə-türkman" və yaxud sadəcə "türkman"lar İraqda yaşayan azərbaycanlılar, yəni kərküklülərdir. Qeyd edək ki, bugünkü müasir dövrdə belə kərküklər özlərini də, azərbaycan türklərini də (azərbaycanlıları da) türkman adlandırırlar. İraq türkman alimləri də daxil olmaqla bütün tədqiqatçılar "türkman" etnonimindən danışarkən onun "ulu türk", "xalis türk", "əsl türk" mənasında işləndiyini sübut edirlər. İndinin özündə belə ədəbi dilimizdə və İraq türkman ləhcəsində işlək olan azman, qocaman, orman, ataman, şişman, və digər buna bənzər kəlmələrdə "man"ın "ulu", "böyük", "əzəmətli" anlamında işlənməsi dediklərimizi təsdiqləyir.

Azərbaycan dilində ensiklopedik informasiya bazalarından ən mükəmməli olan "Azərbaycan Sovet Ensiklopediyası"nda qeyd edilir ki, Türkmanlar (İraq azərbaycanlıları və ya İraq türkləri) – İraqın şimalında yaşayan türk etnosudur. Ad oxşarlığına baxmayaraq, türkmanlar mənşə baxımından Orta Asiya türklərinə və türkmənlərə deyil, azərbaycanlılara yaxın olan Oğuz türklərindəndirlər.

Onu da qeyd edək ki, Təkə-türkman söz birləşməsində işlənən "təkə" sözü də türkmanlara aid olmaqla Təkə-türkman tayfasının bir qolu olan təkəlilərlə bağlıdır. Səfəvilərin hakimiyyəti dövründə dövlətin siyasi işlərində mühüm rol oynayan təkəlilərin bir hissəsi mərkəzi hakimiyyətə qarşı çıxdığına görə 1596-cı ildə I Şah Abbas tərəfindən məhv edilmiş, qalanları isə Azərbaycanın müxtəlif yerlərinə köç etməyə məcbur olmuşdur.

Yaşlı insanlar nəql edirlər ki, altı əsr bundan əvvəl (XV əsrdə) tanınmış soylardan (nəsildən) olan iraq türkündən (kərkükdən) Abdulkərim və Abduləzim adlı iki qardaş hər il yazda, öz mal-qarasını götürüb, yayın cansıxıcı istisindən xilas olmaq məqsədi ilə indiki Qasımuşağı obasının ərazisindəki sərin yerlərə, yurdlara köçürdülər. Payıza dönəndə isə yenidən geriyə öz yaşayış məskənlərinə dönürdülər. Xeyli müddət sonra fasiləsiz müharibələr bu tayfanı burada həmişəlik məskən salmağa məcbur etdi. Qasım bu iki tanınmış qardaşlardan (kərküklərdən) birinin, Abdulkərimin oğlu idi. XVIII yüzilliyin əvvəllərində Kürdhacı, Şəlvə, Hacısamlı, Şamkənd, Ələkçi, Çorman, Qarasaqqal, Araxış və digər kənd və şenliklərində daimi yaşayışın bünyadını qoyan insanlar Qasımın törəməsi hesab edilirlər. Nəticədə onların məskunlaşdıqları ərazi ümumilikdə Qasımuşağı obası

(Qasımuşağı dərəsi) adlandırılırdı ki, bu da Qasımın uşaqları, Qasımın nəslinin məskunlaşdığı yer mənasını daşıyır.

XVII əsrin sonu-XVIII əsrin əvvəllərində isə Səfəvilər dövləti qorxunc bir iqtisadi və siyasi böhrana uğradığı üçün ölkədə yaranmış vəziyyət əhalinin bütün təbəqələri arasında haqlı narazılığa səbəb olurdu. Bu narazılıqları aradan qaldıracaq bir başçıya ehtiyac duyulan zaman Nadir şah Əfşar özünü şah elan etdi. Qasımuşağı tayfası Nadir Şahın dönəminə qədər tam sərbəst bir yaşam tutmuşdu. Tayfa üzvlərinin bir hissəsi yayda yaylağa, qışda qışlağa köç edər, heyvandarlıqla məşğul olardı. Daimi yaşayış yerlərində birgə yaşasalar da yazın əvvəllərindən yaylağa köçəndə alaçıq quran zaman birgə deyil, iki və yaxud üç ailə bir yurda düşərdi. Beləliklə, xudmani həyat yaşayan tayfa üzvləri payızın sonlarında – Arana qayıdan zaman digər elliləri ilə ünsiyyət qurardı.

Bir-birinin ardınca parlaq qələbələr çalan Nadir Şah Əfşar Hindistan yürüşlərindən qələbə ilə geri dönən zaman Xorasanda bir çox tayfalar Nadir şahı şah kimi tanımadıqlarını bildirdilər və hətta ona qarşı müqavimət göstərdilər. Bundan hirslənən Nadir şah Əfşar ona qarşı çıxan əyanları tayfa üzvləri ilə birlikdə Qarabağa, Şirvana, Naxçıvana və İrəvana köçürdü. Həmin dövrdə Nadir şahla qohumluq əlaqəsi olan Qasımuşağı tayfasının əsas hissəsi Cənubi Azərbaycanın Xorasan əyalətində binə qurmuş və Nadir şah Əfşarı şah kimi qəbul etməklə yanaşı, ona dəstək verərək yaşayışlarını davam etdirirdilər.

Ancaq bu çox sürmədi. Bir müddət sonra Nadir şahın apardığı mərkəzləşdirmə siyasəti feodal əyanlarının maraqlarına toxunduğundan sarayda sui-qəsd ab-havası yetişdi və beləliklə, 1747-ci ilin iyununda gecə Nadir şah öz çadırında qətlə yetirildi. Bu hadisədən sonra müharibələrin səngimədiyini görən Qasımuşağı tayfasının başbilənləri Xorasan əyalətindən indiki Azərbaycanın müxtəlif yerlərinə – Cənub bölgəsinə, Qarabağa və Naxçıvana (İrəvanla sərhəd bölgəsinə) köç etməyə başladılar. Qasımuşağı tayfası Xorasanda binə quran zaman Şadlı, Qarabağa köç etdikdən sonra isə Qaraçorlu tayfa birliklərinin tərkibində duruş gətirmişdi. Qarabağa köç etdikdən sonra digər tayfalar kimi Qasımuşağı tayfası tamamilə itaətdən çıxaraq heç bir xəzinəyə vergi ödəmirdilər. Siyahıya alma zamanı sığınacaq yaxınlığında yaşadıqlarından sığnacağa çəkilib gizlənər və siyahıya alma qurtardıqdan sonra yaşayış yurdlarına dönərdilər. Bu səbəbdən də siyahıya alma zamanı Hacısamlı nahiyəsinin, o cümlədən Qasımuşağı obasının kəndlərində bir çox halda heç kimin yaşamadığı qeyd olunur, yaxud da əhalinin az bir hissəsi göstərilirdi. Səfəvilər dövlətinin IX hökmdarı Şah Sultan Hüseynin qoyduğu ağır vergi şərtləri və XVIII əsrin 20-ci illərində baş vermiş Os-

manlı – Səfəvi müharibələri nəticəsində Qarabağda yaşayan tayfalar xəzinəyə vergi ödəməmək üçün bu cür üsullara əl atırdı. Bəzən isə buna səbəb heyvandarlıqla məşğul olan əhalinin payızın ortalarından baharın əvvəllərinə qədər qışlağa – Aran Qarabağa, qalan vaxtı isə yaylağa – Qırxqız və Dəlidağa köç etməsi olurdu. Əhalinin cüzi bir hissəsi isə daimi yaşayış yerində gün-güzaran keçirərdi. Məsələn: 1727-ci ildə Qasımuşağı obası Xaçın sancağının Xaçın nahiyəsinin tərkibində yerləşmiş və siyahıya- alma zamanı kəndlərin çox hissəsində heç kimin yaşamadığı qeyd edilmişdir. 1827-ci ildə isə Xaçın məlikliyinin Mağavuz nahiyəsinin tərkibində qərar tutan Qasımuşağı obasının kəndlərində dövlət tərəfindən aparılan siyahıyaalma zamanı obada cəmi 60 ailənin (300 nəfərin) yaşadığı qeyd edilir. Araşdırmalar aparan zaman məlum olur ki, siyahıda olanlar orada yaşayan əhalinin çox az bir hissəsidir.

Qarabağ ərazisində özünü xan elan edən Pənahəli xan tez bir zamanda tayfaların itaətsizliyinə son qoydu. Əvvəlcə tayfa üzvləri müqavimət göstərsələr də, sonda "bu hənanın o hənadan olmadığını" başa düşüb xanlığa tabe oldular.

Qarabağ bəylərbəyliyinin süqutu, Qarabağ xanlığının təşəkkül tapdığı bir dövrdə Qasımuşağı tayfası tərəfindən köhnə dədə-baba yurdunda yenidən ilk daimi yaşayış məntəqəsini bərpa edən Şirin bəy Hüsən (bəzi mənbələrdə Hüsam) bəy oğlu olmuşdur. Xorasan əyalətində səngimək bilməyən qarət və müharibələr Şirin bəyə Xorasandan köçüb Hacısamlı nahiyəsindəki dədə-baba yurd yerlərində məskunlaşmağa qərar verdirdi.

Tarixi mənbələrdə araşdırmalar aparan zaman aydın olur ki, bu tayfa Qasımuşağı tayfası kimi tam formalaşmamışdan öncə Babadinli (bəzən Babadünlü) tayfa adını daşımış və ya həmin tayfanın bir qolu olmuşdur. Yaşlıların söyləməsindən aydın olur ki, Babadin sözü "dinə inananların alisi", "əsl dinə inananlar", "əvvəldən, qədimdən dinə inananlar" mənasını ifadə edir, "baba" və "din" sözlərinin birləşməsindən əmələ gəlmiş mürəkkəb sözdür. Burada "baba" ulu, böyük, ali, uca mənasındadır. Tayfanın Kavanlı tirəsi qədim Babadin tayfa adını Hacısamlı nahiyəsinin ərazisində əsası qoyulmuş Babadin kəndinin adında yaşatmağa çalışmışlar.

Qasımuşağı tayfasının tarixi köklərini araşdıran tanınmış filoloq Əli Umud oğlu Əliyevə görə, bu tayfa tirələri ilə birlikdə Qaraqasımlı qəbiləsidir. Təkə-türkman soylu bu tayfa "Təkəli" və yaxud "Türkman" tayfasının bir qolu olmaqla əslən Təkə-Türkman mahalındandırlar. Təkə-Türkman mahalı haqqında Koroğlu dastanının "Koroğlunun Türkman səfəri" qolunda məlumat verilir. Qeyd edim ki, Koroğlu yarı mistik xalq qəhrəmanı olsa da,

onun real həyatda təxminən XIV əsrin axırı – XV əsrin əvvəllərində yaşadığı güman edilir.

Bir çoxları isə səhvən Qasımuşağı tayfası deyərkən tayfa adının Qasım Hacı Sam oğlunun adı ilə adlandırıldığını düşünür və yalnız Qasım Hacı Sam oğlunun törəmələrini (hacısamlıları) Qasımuşağı tayfasının üzvləri hesab edir. Əslində isə bu belə deyil. Qeyd edək ki, Qasımuşağı tayfasının ulu babası Qasım (Qara Qasım) Abdulkərim oğludur və tayfa aşağıda göstərilən tirələrdən ibarətdir:




**Qasımuşağı tirəsinin** ulu babası Qasım Hacı Sam oğludur. Qasımuşağı tayfası Qurdqajı (indiki Kürdhacı), Birinci Çorman, İkinci Çorman, Bozdağan, Araxış, Aşağı Qarasaqqal, Hacısamlı şenliklərini salmışdılar. Onu da qeyd edək ki, məhz Hacısamlı kəndi və Hacısamlı nahiyəsi Hacı Sam İslam oğlunun şərəfinə onun adı ilə adlandırılmışdır.

**Qarabayramlı tirəsinin** ulu babası Qara Bayram Şəvə oğludur. Qarabayramlı tayfası Şəlvə, Qabaqtəpə-Daşlı, Kalafalıq-Daşlı, Canıbəyli, Narışlar, Vəlibəyli, Budaqdərə, Hacıxanlı, Qovuşuq, Kaha kəndlərini yaratmışdılar.

**Əhmıduşağı tirəsinin** ulu babası Əhməd Qara Bayram oğludur. Əhmıduşağı tayfası Ələkçi, Arxaş yeri, Doqqazlı, Şamkənd, Yuxarı Qarasaqqal şenliklərini salmışdılar.

**Kavanlı tirəsinin** ulu babası Kavan İslam oğludur. Mənbələri araşdırarkən məlum olur ki, hacısamlıların, qarabayramlıların və əhmıduşağının Xorasan əyalətindən Qarabağa köç etməsindən əvvəl Kavanlı tayfası artıq Zəngəzurda, Şərur-Dərələyəz (bəzi mənbələrdə Şərur-Daralagöz) tarixi vilayətinin dağlıq hissəsi olan Dərələyəz (Daralagöz) mahalında binə bağlamış, yer-yurd sahibləri idilər. Kavanlı tayfası Hacısamlı nahiyəsinin ərazisində Bülüldüz, Ayıbasar, Birinci Tığik, İkinci Tığik, Birinci İpək, Yuxarı İpək, Orta İpək, Zəkir, Babadin, Qarakişilər, Palçıqlı, Dərəkənd şenliklərinin bünyadını qoydular. 1970-ci illərin sonu, 1980-ci illərin əvvəllərində Orta İpək, Zəkir, Babadin, Qarakişilər, Palçıqlı, Dərəkənd yaşayış məntəqələrində artıq yaşayışa son qoyulmuşdu. Bu yaşayış məntəqələrinin xarabalıqları son dövrlərə qədər qalmaqda idi.

Türk xalqlarının tarixinə nəzər salsaq görərik ki, müharibə və başqa səbəbdən bu xalqlar yaşayış yerlərini dəfələrlə dəyişmiş, yaşadıqları ərazilər kiçilib-böyümüş, dini dəyişmiş, ancaq dəyişməyən bir şey vardır ki, o da bu

xalqın dili olmuşdur. Qasımuşağı tayfası müxtəlif dövrlərdə bir-birindən fərqli bölgələrdə, müxtəlif xalq və millətlərlə qonşuluq şəraitində yaşasa da öz doğma dilini unutmamışdır.

Qasımuşağı tayfası Azərbaycan türkcəsinin bədii dilinə çox yaxın dildə danışan tayfalardan biridir. Bu tayfa çox tipik bir türkman tayfası xüsusiyyətlərini qoruyub saxlamış və özündə daşıyır. Yaxınlıqda yaşayan digər tayfalara nisbətən nümunə göstəriləcək şəkildə çox təmiz və gözəl bir Azərbaycan türkcəsində danışırlar. Qeyd edim ki, tayfa üzvləri xeyli müddət Xorasan bölgəsində dövran sürsə də nə fars, nə də kürd dilində olan sözlər və ya kəlmələr bu tayfanın dilində mövcud deyildir.

Qasımuşağı tayfasının tayfa üzvləri islam dininə etiqad edirlər. Bu tayfa islam dininin şiə təriqətinə mənsubdurlar.

Camaat arasında bu tayfaya məxsus müxtəlif adət-ənənələr, deyimlər, kəlamlar, inanclar, baməzə söyləmələr mövcud olmuşdur. Əkin-biçin işlərində, xeyir-şər mərasimlərində "hov" təşkil edilər, toxuculuq işləri və digər vaxt tələb edən işlərdə "iməci" gedilərdi.

Əhali arasında maraqlı adətlərdən biri də uşağa ad qoyulması məsələsidir. Yeni doğulmuş uşağın adını ata-ananın adına uyğunlaşdırmaq, həmçinin baba-nənənin, əmi-dayının sağlığında onların adının anadan olmuş uşağa verilməsi, həmin adın yaşadılması çox yayılmış və bu gün də davam edən bir ənənədir.

Tayfa üzvləri əsasən heyvandarlıqla, toxuculuqla, qismən isə əkinçiliklə məşğul olurdu. Yatağı, yaylağı, əkənəcəyi, biçənəyi, məzrələri var idi. Yay aylarında yaylaqda mal-qara saxlayıb onun məhsullarını emal edər, yaylağa qalxmayan tayfa üzvləri isə əkin-biçinlə məşğul olar, xalça və xalça məmulatları toxuyar, qırmızı palıddan, armuddan, cökədən və vələsdən müxtəlif məişət əşyaları və qurğuları hazırlayardılar. Taxta qab-qacaq, o cümlədən təknə, tabaq, nehrə, cəhrə, çanaq, qollu tərəzi, yun darağı (yun daramaq üçün), hana (xalça toxumaq üçün), yer hanası (şəddə, örkən toxumaq üçün) belə əşyalara misal ola bilər. Sovet dönəmindən öncə məskunlaşdığı ərazilərdə yaxşı qışlağı olmayan Qasımuşağı tayfası üzvlərinin xeyli hissəsi payızın sonlarında öz heyvanları ilə Aran Qarabağa köç edir, dağda qalan tayfa üzvləri xışla yer şumlayır, bağ-bostan işləri ilə, mövsümi peşə olan duz daşımaqla, kömür yandırmaqla və arıçılıqla məşğul olurdu. Əkinçilər buğda, arpa, çovdar, pərinc, darı əkər, əldə edilən dən obanın ərazisində olan dəyirmanlarda üyüdülərdi. Meşədə bitən cır meyvə və giləmeyvələrdən meyvə qurusu (qax) hazırlanır, müxtəlif məqsədlər üçün istifadə edilirdi.

Tayfa üzvləri heyvandarlıqla məşğul olduğundan dağa-arana getməli olur, bəslənən heyvanları və hazır məhsulları (heyvandarlıq məhsulları, arı-

çılıq məhsulları, xalça, xalça məmulatları, qab-qacaq, təsərrüfat alətləri və s.) aran zonasındakı şəhərlərə (bazarlara) çıxararaq ehtiyac hiss edilən ərzaq və qeyri ərzaq məhsulları ilə al-dəyiş edir, yaxud da nağd pula satırdı. 1905-1907-ci il hadisələrinə qədər belə məhsulları Gorus və Qarakilsə bazarlarına da çıxarardılar. Sovet hakimiyyəti illərində isə belə məhsullar əsasən Şuşa, Ağdam, bəzən isə Bərdə şəhərində yerləşən bazarlara çıxarılırdı.

İstehsal edilən yun, pambıq, ipək iplərdən xalça, kilim, palaz, fərməş, xurcun, şəddə, yun şal (parşa), qəlib və digər məmulatlar toxumağı, müxtəlif növ tikmələr tikməyi bacarırdılar. Toxuculuğun inkişafı nəticəsində ailələrin əksəriyyətində toxuculuq alətləri, o cümlədən toxucu dəzgahlar (hana və yer hanası) var idi.

Yay aylarında tayfanın bir çox hissəsi Qırxqız, Dəlidağ və Sarıbaba yaylaqlarında yaylaqlanır və buna görə də qəlib (keçə) hazırlanmasına daha çox üstünlük verilirdi. Bu qəliblər müxtəlif rənglərdə; qara, boz, sürməyi, qəhvəyi, bəzi hallarda isə ağ olurdu (ağ qəliblər əsasən varlı və yaxud bacarıqlı ailələrdə toxunardı).

Azərbaycan xalçaçılıq məktəbinin Qarabağ tipinin Cəbrayıl qrupuna aid edilən "Qasımuşağı xalçaları" öz adını məhz bu tayfanın adından almış, ilk dəfə tikmə ("Qasımuşağı tikmələri") şəkilində hazırlanmış, bir müddət sonra tayfa üzvləri tərəfindən xalçalara köçürülmüşdür.

Sovet dönəmində Azərbaycan SSR-nin iqtisadi həyatında əsaslı rol oynayaraq, kənd təsərrüfatı məhsullarının əsas hissəsinin istehsalında onların xüsusi payı vardı.

Füsunkar təbiəti – sıldırım qayaları, sərt iqlimi, dik yamacları, uca zirvələri, keçilməz bənd-bərələri, əzəmətli sığınacaqları, bərəkətli torpağı olan Kavanlı, Şəlvə və Qasımuşağı obalarının sakinləri arasında bu yerlərin coğrafi qurluşuna uyğun xarakterli övladları yaşayırdı. Tarixi mənbələrə nəzər salan zaman aydın olur ki, bu yerlərin başı bəlalı, lakin müdrik, qərarlı, cəsur, mərd oğulları döyüşkən olmaqla bərabər gözəl at çapar, tüfəngdən sərrast atəş açardılar.

Qasımuşağı tayfasından 1867-ci ildə Məşədi Abbas İlyas oğlu, Uğurlu Şahverdi oğlu, Həsən Bayram oğlu ətraf kəndlərdə tanınır, çörəkləri, bol süfrələri ilə ad çıxarmışdılar. 1887-ci ildə isə Teymur Qulu oğlu, Həsənəli Hüseynəli oğlu üzdə idilər. Xurşidbanu Natəvan tərəfindən Şuşada keçirilən məclis və şənliklərdə tez-tez iştirak edən şair Məmmədalı Alyar oğlu, Zəngəzurda böyük mülkləri olan, bölgədə müdrik kəlamları və öz qoçaqlığı ilə tanınmış bəy – Paşa bəy Sultanov, Azərbaycan Demokratik Respublikasının ilk müdafiə naziri, Qarabağ General Qubernatoru, həkim – Xosrov bəy Sultanov, cəsarəti ilə ad-san qazanmış xalq qəhrəmanı – Sultan bəy Sul-

tanov, Azərbaycanın Milli Qəhrəmanı, Xocalı soyqırımı şəhidi – Ələsgər Novruzov, Azərbaycanın Milli Qəhrəmanı, Qarabağ müharibəsi şəhidi – Fazil Mehdiyev, Qarabağ müharibəsi iştirakçısı, "İgidliyə görə" medalı ilə təltif edilmiş, Qarabağ müharibəsi şəhidi – Xəqani Axundov, tanınmış filoloq, filologiya üzrə fəlsəfə doktoru – Əli Umud oğlu Əliyev, Qarabağ müharibəsi iştirakçısı, bir neçə şeirlər kitabının müəllifi, tanınmış şair – Bəxtiyar Kavanlı, 1970-ci illərdə ədəbiyyata gəlmiş, bir neçə şeirlər kitabının müəllifi, şair – Adil Şirin, şeirləri ilə tanınan, bir kitab müəllifi, şair – Sadıq Şükür oğlu Mirzəyev, iki kitab müəllifi, şair – Rafael Yusifəli oğlu Hətəmov (Laçınlı) və digərlərini qeyd etmək olar.

Qasımuşağı obasının kəndləri 1992-ci il 29 may tarixində Ermənistan Respublikası Silahlı Qüvvələri tərəfindən işğal edildikdən sonra Qasımuşağı tayfası Azərbaycan Respublikasının digər rayonlarında müvəqqəti məskunlaşmışdılar. Həmin dövrdən bu günə qədər yurdunda eli görünməyən doğma obalarlımızın sakinləri müxtəlif bölgələrdə pərakəndə halda yaşamağa başladı. Çox təəssüflə qeyd etməliyəm ki, bir-biri ilə çətinliklə əlaqə saxlayan tayfa üzvləri arasında olan əlaqələr getdikcə zəifləyir.

**Sultan HÜMBƏTOV**

**KİTAB RƏFİ**




## "KİMYA MÜƏSSİSƏLƏRİNDƏ İNVESTİSİYA SİYASƏTİNİN FORMALAŞMASI İSTİQAMƏTLƏRİ"

"Kimya müəssisələrində investisiya siyasətinin formalaşması istiqamətləri" adlı monoqrafiya işıq üzü görüb. İqtisad elmləri doktoru, professor Təbriz Əliyev və iqtisad elmləri üzrə fəlsəfə doktoru, dəyərli eloğlumuz Mahir Abbaszadənin birgə müəllifliyi ilə çap olunan monoqrafiyada kimya sənayesi müəssisələrində investisiya siyasətinin aparılmasına sistemli yanaşma mexanizminin formalaşmasının nəzəri-metodoloji aspektləri araşdırılmışdır. Müəssisələrin texniki-texnoloji səviyyəsi, onların innovasiya prosesinin təşkilinin investisiya təminatı təhlil olunaraq qiymətləndirilib.

Kitab sənaye müəssisələrinin rəhbər işçiləri və mütəxəssisləri, həmçinin elmi-tədqiqat, layihə-konstruktor texnoloji institutlarının işçiləri, aspirantlar və magistrantlar üçün nəzərdə tutulub.

*Dünyanın ən yüksək yaşayış məskənlərindən biri olan (dəniz səviyyəsindən 2350 m hündürlükdə), dağlarla göylərin "qovuşduğu" məkanda qərar tutan Xınalıq kəndində şair qəlbli sadə bir insan yaşayır. Həm də qonaqpərvərliyi ilə seçilən Yusif Şabanovun şeirləri məni xeyli təsirləndirdi və onun kövrək notlarla qələmə aldığı "Bacılar" şeirini "Laçın yurdu"nun oxucularına təqdim etmək istədim.*

**Xalid NƏCƏFOV**



## BACILAR

Qardaşın halını pərişan görsə
Alışan bacılar, yanan bacılar!
Xəstələnsə yastığının yanında
Gecəni gündüzə qatan bacılar!

Sizsiz bahar olmaz, yaz ola bilməz,
Mizrab ola bilər, saz ola bilməz.
Canımda dərdlərim az ola bilməz,
Ən ağır dərdlərə dərman bacılar!

Ürəyimə dəysin sizə dəyən daş,
Dərdimə dərmansız, qəmimə yoldaş.
Siz həm atasınız, həm də ki qardaş,
Həm də anasınız, anam bacılar!

Bir gecə yatmadım, açıldı sabah,
Daş da dilə gəldi mən çəkəndə ah.
Sizə kömək dursun qüdrətli Allah,
Yusif olsun sizə qurban, bacılar!

*09.08.2011*

***Yusif Hacı oğlu Şabanov***
***(Xınalıqlı)***

**QARABAĞ QAZİLƏRİ**

## AQŞİN MƏMMƏDOV



Məmmədov Aqşin Eldar oğlu 1 iyul 1969-cu ildə Laçın şəhərində fəhlə ailəsində anadan olub. Əslən Laçının Cağazur kəndindəndir. 1976-1986-cı illərdə Laçın şəhər 2 saylı orta məktəbində təhsil alıb. 1987-1989-cu illərdə Özbəkistan SSR-də hərbi xidmətdə olub. 1990-cı ildə Laçın Rayon Rabitə qovşağında poçtalyon kimi işə başlayıb. 1991-ci ildə Laçın rayonunda yaradılmış könüllülərdən ibarət 811 saylı alayın ilk döyüşçülərindən olub. 17 may 1992-ci ildə rayonun Fətəlipəyə kəndində Qradqurğusu maşını ilə qəzaya düşərək müxtəlif bədən xəsarətləri alıb.

Laçın şəhərinin işğalından sonra 811 saylı hərbi hissənin tərkibində Suarası, Səfiyan, Güləbird, Malxələf kəndləri uğrunda gedən döyüşlərdə iştirak edibdir. 1992-ci ilin payızında Aqşin Məmmədovun xidmət etdiyi 811 saylı hərbi hissə Kəlbəcər rayonu istiqamətindən Laçın rayon ərazisinə daxil olaraq Bülüldüz, Tığik, Qozlu, Təzəkənd və Sarıbaba dağını ermənilərdən azad etmişdir.

Aqşin Məmmədov 811 saylı alayın ləğv edilməsindən sonra 1993-cü ilin noyabr ayında Laçın Rayon Polis Şöbəsinin Post Patrul Xidməti bölüyündə polis nəfəri kimi işə qəbul edilib. Laçın polisi Füzuli rayonunun Bəhmənli, Yağlıvənd, Kərimbəyli, Arayatlı, Əhmədalılar, Horadiz kəndləri uğrunda gedən döyüşlərdə çox böyük fədakarlıq göstərmişdir və adları çəkilən yaşayış məntəqələri işğaldan azad edilmişdir. Aqşin Məmmədovun Laçın polisinin tərkibində döyüşlərdə göstərdiyi fədakarlıq Azərbaycan Respublikası Prezidenti Heydər Əliyev tərəfindən yüksək qiymətləndirilmişdir. Ümummilli liderimiz 18 dekabr 1992-ci ildə onu “Azərbaycan Bayrağı” ordeni ilə təltif etmişdir.

Aqşin Məmmədov 1999-cu ilə qədər yuxarıda adları çəkilən bölgələrdə xidmətdə olmuşdur. 2004-2008-ci illərdə Azərbaycan Daxili İşlər Nazirliyinin Polis Akademiyasında təhsil alıb. Hal-hazırda Laçın Rayon Polis Şöbəsində baş-leytenant rütbəsində sahə rəisi vəzifəsində işləyir.

Ən böyük arzusu şəhidlərimizin intiqamını almaq, üç rəngli bayrağımızı Laçında, Qarabağda dalğalandırmaqdır.

## DİŞİ ASLANLARIMIZ

## KİŞİ TAVAT



Hümbətova Tavat Səməd qızı 1898-ci ildə Yelizavetpol quberniyasının Zəngəzur qəzasının Alxaslı kəndində anadan olmuşdur. O, ilk təhsilini Minkənd kənd orta məktəbində almışdır. Tavatın gəncliyi hər saat ölüm, hər saat qorxu içində keçib. O, qanlı-qadalı günlər yaşayıbdır. Toy ərəfəsində Tavatın nişanlısını erməni quldurları 1918-ci ildə vəhşiliklə öldürmüşdülər. Tavat nişanlısının paltarını geyinib qəbri üstündə onun intiqamını alacağına and içir.

Beləliklə, Tavat gəlinlik paltarını nakam sevgilisi Teymurun paltarı ilə əvəz etdi. Tavat atlanaraq əlində silah ermənilərə qarşı vuruşmuşdu. O, ermənilər yaşayan Dığ kəndinə gecənin qaranlığında gələrək, nişanlısını vəhşicəsinə öldürən Hamparsunu və onun müsəlmanları qəddarlıqla qətlə yetirən dörd oğlunu güllələyir, onlardan öz intiqamını alır. Sonralar isə “Kişi Tavat”, “Erkək Tavat” ləqəbiylə məşhur olur.

Tavat həmişə məğrur, cəsur olduğu kimi də əməksevər və dövlətçiliyə sadiq insan olmuşdur. O, Quba şəhərində Səməd Ağamalı oğlunun savadsızlığı ləğv etmək üçün təşkil etdiyi məktəbdə oxumuş, həm də Quba qəzasında işləmişdir.

Alxaslı kəndində Qəza İcraiyyə Komitəsinin sədri vəzifələrində işləmişdir. Kəndin abadlaşmasında, kolxoz təsərrüfatının təşkilində, anbarların, ictimai tövlələrin, məktəbin tikilməsində, əhali arasında savadsızlığın ləğv edilməsində böyük işlər görmüşdür.

Kəlbəcər rayon Qəza İcraiyyə Komitəsinin sədri, Ağdam rayon Qəza İcraiyyə Komitəsinin və Laçın rayon Qəza İcraiyyə Komitəsinin sədr müavini vəzifələrində işləmişdir. O, Laçın şəhər XDS İK-nin sədri vəzifəsində də çalışmış, dəfələrlə kənd sovetinə, rayon sovetinə deputat seçilmişdir.

Tavat Hümbətova ömrünü Laçın, Kəlbəcər, Ağdam rayonlarında və kəndlərində quruculuq işlərinin görülməsinə, məktəblərin tikilməsinə, əhali arasında savadsızlığın ləğv edilməsinə, mədəniyyət və səhiyyə müəssisələrinin, ticarət obyektlərinin yaradılmasına, rayon və kənd yollarının salınmasına, kənd təsərrüfatının bitkiçilik və heyvandarlıq sahələrinin inkişafına sərf etmişdir .

Tavat Hümbətova harada olursa olsun, hər yerdə öz ağlı, savadı, zəhmətsevərliyi, sadəliyi ilə insanların hörmətini və sevgisini qazanmışdır. Ta-

vat Hümbətova kasıbların, imkansızların, yetimlərin yol göstərəni, çörək verəni və arxası olubdur. Doğrudan da böyük qəlbli insanlar olmasaydı, həyatın heç bir mənası olmaz, köməksiz qalar, ümidsizlik bəşəri sarsıdardı.

Hər bir insanın qiyməti onun Vətənə, torpağa, xalqa göstərdiyi xidmətlə müəyyən olunur. Onun xidmətləri dövlət tərəfindən yüksək qiymətləndirilmişdir. O, dəfələrlə orden və medallarla, fəxri fərmanlarla təltif edilmiş, 50 il kommunist partiyasının üzvü olmuş və dövlət qulluqçusu təqaüdü almışdır.

***Təqdim etdi:* Firdovsi TAĞIYEV**

**BİOQRAFİK TANITIM**

## İLHAM MUSAYEV



Musayev İlham Telman oğlu 1965-ci il fevralın 12-də füsunkar təbiəti olan Laçın rayonunun Sadınlar kəndində dünyaya göz açıb. 1980-ci ildə Sadınlar kənd 8 illik məktəbini, 1982-ci ildə Qarıqışlaq kənd orta məktəbini bitirib.

1983-cü ildə S.Ağamalıoğlu adına "Şərəf nişanı" ordenli Azərbaycan Kənd Təsərrüfatı İnstitutunun (indiki Azərbaycan Dövlət Aqrar Universiteti) iqtisadiyyat fakültəsinin mühasibat uçotu şöbəsinə daxil olub.

1987-ci ildə institutu bitirib təyinatla Laçın rayon Aqrar Sənaye Birliyinə işə göndərilib və 1988-ci ilin may ayına qədər burada iqtisadçı vəzifəsində çalışıb.

1988-ci ilin may ayından 1989-cu ilin noyabr ayına kimi Moskva şəhərində həqiqi hərbi xidmət keçib. Hərbi xidməti başa vurduqdan sonra doğma rayonuna qayıdıb. 1990-1991-ci illər ərzində Laçın rayon Maliyyə Şöbəsində iqtisadçı, 1991-ci ildən 1995-ci ilin sentyabr ayına kimi Dövlət Sosial Müdafiə Fondunun (DSMF) Laçın rayon şöbəsində baş mühasib, 1995-1996-cı illərdə "İskoopbank" Səhmdar Kommersiya Bankında kredit üzrə iqtisadçı işləyib. 1996-cı ildən bu günə kimi kommersiya və Bakı şəhərinin Suraxanı rayonu ərazisində yerləşən şəxsi fermer təsərrüfatı ilə məşğuldur.

Ailəlidir, üç övladı var.

**Təqdim etdi: Elnur MEHDİYEV**

**POEZİYA**

## TOFİQ YUSİF



Hüseynov Tofiq Yusif oğlu 1950-ci ildə anadan olub. Orta мəktəbi medalla bitirib. İki ali təhsil alıb. “Bir taleyin göynəmləri”, “Tərtər şəhidləri”, “Tərtər inciləri”, “Qan iyi”, “Ömrümün payızı”, “Vəhşilər”, “Mənsizləşmə fəlakəti” və “Ölümlə üz-üzə” kitablarının müəllifidir. Azərbaycan Mətbuat Şurasının, Azərbaycan Yazıçılar Birliyinin və Azərbaycan Jurnalistlər Birliyinin üzvüdür. «Qızıl Qələm» və «Məmməd Araz» mükafatları laureatıdır. Hazırda Tərtər şəhərində yaşayır.

### ÇOBANDIR DAĞLAR

Mənə elə gəlir çobandır dağlar,
Şimşəyi çiyninə sıxıb çomaqtək.
Tufanda sürüsü azmasın deyə
Kaha dodağında dillənir tütək.

Buludları qəfil şaqqalar şimşək –
Çəkər yapıncıdan çomağı dağlar.
Sellər daş sürünü çoban ititək
Qatıb qabağına dərəyə qovar.

Üstü bər-bəzəkli dəsmal yerinə
Qoyar döş cibinə qaraquşu dağ.
Duman qayğı kimi tutub gözünü –
Olmaya bu gecə yağış yağacaq?

Gecə canavarla vədələşəndə
Dağlar yatmayıblar səhərə qədər.
Balınc təpələrə dirsəklənərək
Səksəkə içində mürgü döyüblər.

Sıxar qar papağı gözləri üstə,
Yellənər çən şərfi külək əsdimi.
Dar gündə arxadır biri-birinə
Dağlar qədirbilən çobanlar kimi.

*1973-cü il*

### İMKANIM OLSAYDI…

Siyirib çıxartdın məni dərdimdən –
Qucağı beşiktək boş qaldı dərdim.
İmkanım olsaydı kirpiklərimdən
Ayaq izlərinə çəpər çəkərdim.

Usta qəm əlində sarı simiydim,
Bir himə bəndiydim hönkürüm, dinim.
Özüm öz içimdə qərib kimiydim,
Özümü özümə qaytardın mənim.

Dəyişdi günümün, ayımın köçü,
Sevinc yuva qurdu diləklərimdə.
İmkanım olsaydı bu qayğı üçün
Səni saxlayardım bəbəklərimdə.

Düşmüşdüm bir həsrət burulğanına,
Ömrümü havayı çözələyirdim.
İmkanım olsaydı dönüb qanına
Səndə ömrün boyu dövr eləyərdim.

*1982-ci il*

## XANLAR ƏMİNİN GÜLMƏCƏLƏRİ

Allah rəhmət etsin Xanlar əmiyə, çox yaxşı kişi olub. O, təqribən 1870-ci illərin əvvəllərində Laçın rayonunun İmanlar kəndində anadan olmuş, 1970-ci illərin sonlarına kimi, düz bir əsrdən artq, kişi kimi yaşamışdır. Rəhmətlik qısaboy, sarıyanız, nurani kişi idi. Kəndimizdə kiçikdən-böyüyə hamı ona Xanlar əmi deyərdi. Yaşadığı ərazidə dövrünün tanınmış şəxslərindən olub. Gənc yaşlarında bir müddət Bakıda yaşayıb işləməyi dünyagörüşünün formalaşmasında mühüm rol oynamışdır.

Necə ki, Şəkidə Hacı dayı, Şəlvə dərəsində də Xanlar əmi lətifələriylə tanınmışdır. Onun lətifələri öz real həyatında baş verən hadisələrlə bağlıdır. Xanlar əminin lətifələri daha çox Molla Nəsirəddin lətifələri ilə uzlaşır. Onun lətifələrindən bir neçəsini sizə çatdırsaq, yaşadığı həyat tərzi ilə daha yaxından tanış olarsız.

### Qaç! Boz öküz gəldi

Xanlar əmi və bir neçə həmkəndlisi taxıl yüklü öküzləri qabaqlarına qatıb karvandan gəlirmişlər. Dağlıq ərazidə bir govdan – aşağısı uçurum olan qayalıqlarla əhatələnmiş dar cığırdan keçərkən, Xanlar əminin karvan yoldaşları bir ağızdan öküzləri nəzərdə tutaraq təkrar-təkrar yalvarırlar ki: “Ya Həzrət Abbas, sən saxla, Ya Həzrət Abbas, sən saxla!”. Lakin elə bu dəm öküzün biri govdan uçur. Bu dəfə də Xanlar əmi çığırır ki: “ Ya Həzrət Abbas! Qaç! Boz öküz gəldi!”.

### Xanlar əmi bazarda

Bir gün Xanlar əmi inəklərindən birini satmaq üçün Ağdam bazarına aparır. Bazarda hansı dəllal gəlirsə hamısı ayrı-ayrılıqda Xanlar əmidən soruşurlar ki, bu dananı neçəyə satırsan? Xanlar əmi deyəndə ki, bu dana deyil, inəkdir, onlar başlarını yırğalayaraq aralaşırlar, heç kim inəyi almaq istəmir. Xanlar əmi gözlərini ovuşdurub diqqətlə baxır ki, birdən karıxıb inək əvəzinə dananı gətirmiş olar, ancaq görür ki, yox, elə inəkdir ki var. Onda yəqin edir ki, bunlar sözləşiblər. Ancaq sonda məcbur olub inəyi dana qiymətinə satır.

Xanlar əminin karvanı gəlib dağa çatanda, arvadı alınan əşyaların az olduğunu görüb soruşur:

– A kişi, inəyi neçəyə satdın?!

Xanlar əmi də cavabında deyir:

– Ay arvad, inək nədir? Dana denən.

Arvad deyir:

– A kişi, dəli olmusan? Dörd yaşlı gəzyazan (doğmayan) inəyə dana deyirsən?

Xanlar əmi:

– Bura bax, arvad! Dana məsələsinə özüm də mətəl qalmışam! O ki qaldı dəlilik məsələsinə, gəl gedək Ağdamın bazarına, görək dəli kimdir?!

**Bal məsələsinin həlli**

Xanlar əmi Şəlvədə kənd sovetinin sədri işləyən Həsənalıya bir gün baldan pay göndərir. Həsənalı kişi də bundan sonra tez-tez atlı göndərib ondan bal istəyirmiş. Xanlar əmi də bu atlıları dayandırmaq üçün Həsənalıya bir arı beçəsi bağışlayır və özü də saxlayaraq hər il bal mövsümü balını kəsib ona göndərəcəyini deyir. Lakin yenə Həsənalı kişi ayda bir, iki aydan bir atlı göndərib Xanlar əmidən bal istəyirmiş. Bir gün yenə çillənin ortasında Həsanalı kişi atlı göndərir ki, Xanlar kişi, vacib qonağım gəlib, arımın balından xeyli göndər. Xanlar əminin bu dəfə lap acığı tutur və məsələni birdəfəlik həll etmək üçün ona verdiyi arını suya verib, mayasını Həsənalıya göndərir.

Bir müddət ara verəndən sonra yayda Həsənalıyla rastlaşır.

Salam-kəlamdan sonra Həsənalı soruşur:

-Balı nə vaxt kəsirsən, Xanlar kişi?

Xanlar əmi deyir:

-Bura bax, Həsənalı! Çilənin günü könlü bal istəyən sən deyildinmi?

Həsənalı kişi:

-Yoxsa, mənim arımı suya...

Xanlar əmi onun sözünü ağzında qoyub:

-İncimə, Həsənalı, bu bal məsələsinin yeganə həll yoluydu.

**Huri-mələk sevdası**

Xanlar əmi ötən əsrin əvvəllərində Bakıda Musa Nağıyevin neft mədənində işləyirmiş. Hər maaş vaxtı bir axund peyda olar, xeyriyyə məqsədi ilə pul yığarmış. O, bu pulları fağır-füqəraya paylayacağını deyərək, kim çox pul verərsə onlara cənnət vəd edər, orada huri-mələklərlə kef çəkəcəklərini bildirərmiş. Lakin Xanlar əmi digərlərindən fərqli olaraq, bu axunda inanmaz və dost-tanışları da bu fırıldaqçının kələyindən xilas edərmiş.

Bir gün yenə maaş vaxtı axund peyda olur. Xanlar əmi göz gəzdirib görür ki, Ağdamlı dostu Bayram da huri-mələk sevdasıyla axunda pul verənlərin sırasındadır. Xanlar əmi onu kənara çəkib başa salır ki, axund fırıl-

daqçıdır, əgər sən huri-mələk eşqi ilə bu qədər pulundan keçirsənsə, axşam gəl səni aparım bir bara, orada huri-mələkləri görərsən.

Axşam Xanlar əmi ilə Bayram barda əyləşib, ətrafa göz gəzdirərkən görürlər ki, ayə, həmin axund əyləşib, hər böyründə də bir rus qızı. Qızlar da öz əlləri ilə axunda şərab içirdirlər. Xanlar əmi stoldan qalxaraq axunda yaxınlaşıb deyir:

-Bura bax, Axund qardaş! Bizə vəd etdiyin huri-Mələklər bunlardımı?!

**Çək gəlsin**

Xanlar əminin bir danası itir. Bir neçə gün axtarsa da tapa bilmir ki, bilmir. Axırda yəqin edir ki, dananın başı salamat deyil, onu oğurlayıblar. Fikirləşir və dananın yerini təxmin edərək yollanır filankəsin qapısına. Xanlar əmi görür ki, onlarda bərk qonaqlıqdır. Ev sahibi Xanlar əmini çox sevinclə, gülərüzlə qarşılayaraq, təkidlə evə aparır və ona şəxsən xüsusi xidmət göstətir. Arada bir də yoldaşlarına göz basaraq: "Xanlar əmi, utanma, öz malın kimi ye" deyərmiş. Sonda Xanlar əmi ona deyir ki: "Bura bax, filankəs, vallah bunun səsi sonra çıxacaq".

Günortadan gecə yarısına kimi tut arağından vuran Xanlar əmi aşa -aşa evə qayıdır. Onu nigarançılıqla gözləyən həyat yoldaşı soruşur:

- Kişi, dananı tapdınmı?

Xanlar əmi əlini uzadıb deyir:

-Arvad, çək gəlsin!

Dananın tapılmasını zənn edən arvad əlini şappıltıyla Xanlar əminin əlinə çırpır. Xanlar əmi onun əlini ovcunda saxlayaraq deyir:

-Aaarvad, caamaat keefdə-daamaqda, sən nə haayda! Mən nə haayda!

**10 il ömür verəndə**

Xanlar əmi 100 yaşına varanda bir gün bərk xəstələnir, dili də batır, hamı elə bilir ki, daha kişinin ölüm azarıdı, yığışırlar başına. Həyat Daşdəmir qızı toxtaqlıq üçün Xanlar əmiyə deyir ki: "Qorxma, Xanlar əmi, mən sənə hələ 10 il ömür verirəm".

Bir neçə gündən sonra Xanlar əmiyə yenidən dəyməyə gələn həmin qadına Xanlar əmi deyir:

-Bura bax, Allahın mələyi, xərcin çıxırdı mənə ömür verəndə?

**Dərman məsələsi**

Xanlar əmi xəstələnəndə Şəlvə dərəsində baməzə söhbətləri, şirin yumoru və zarafatçıllığı ilə tanınan Nizami dayı da gəlir ona dəyməyə. Özüylə də bir şüşə tut arağı gətiribmiş. Ondan 50 qram süzüb verir Xanlar əmiyə,

deyir ki, dərmandı. Xanlar əmi onu içəndən bir neçə dəqiqə sonra dili açılır. Nizami dayı gedərkən tapşırır ki, hər gün günorta yeməyində bu dərmandan bir rumka içərsən.

Bir müddətdən sonra kəndin arasındakı yolda “ZİL” maşınla yanından ötüb getmək istəyən Nizamini saxladıb soruşur:

-Bura bax, Nizami, sənin o dərmanından necə əldə etmək olar?

**Xanlar əminin nəvəsi Cabbarov Mətləb Bayram oğlunun söylədiklərindən:** Xanlar əmi Bakıda işləyərkən bolşeviklər Bakını zəbt edirlər. Elə olur ki, Xanlar əmi də daxil olmaqla antisovet təbliğatı ilə məşğul olan bir qrup adamı bolşeviklər saxlayırlar və ardıcıl olaraq hər birini sorğu-sual edib sonda güllələyirlər. 21 nəfərin içərisindən sonda təkcə Xanlar əmini salamat buraxırlar. Xanlar əmi deyirmiş ki: “Bu işə özüm də məəttəl qaldım. Səhərə yaxın evə qayıdanda, evində qaldığım din xadiminin hələ yatmadığını və mənim sağ-salamat qayıtmağım üçün Quran oxuduğunun şahidi oldum”.

Elə həmin mömin də Xanlar əmiyə öz yerinə, yurduna – Laçın rayonunun Şəlvə dərəsinə qayıtmağı məsləhət görür.

Repressiya illərində dövlət məmurları Xanlar əmidən də “qolçomaqlar” əleyhinə ifadə verməsini istəmiş, lakin Xanlar əmi nəinki heç kimin əleyhinə ifadə verməmiş, hətta o dövrdə kolxoz sədri işləmiş və camaatın müraciətinə əsasən kolxozun vurağan buğasını kəsdirən Nuralını (bu barədə “Laçın yurdu”nun 4-cü sayında bəhs olunub) elə həmin məsələyə görə də sovet məmurları Sibirə sürgün edərkən, onlara qarşı çıxmış, Nuralını qurtarmağa çalışmışdır. Lakin onlar da Xanlar əmidən əl çəkməmiş, atını müsadirə etmiş, baxmayaraq ki, o dövrdə müəllimi müharibəyə (1941-1945) aparmırdılar, ancaq onun tək oğlu Əhəd müəllimi qanunsuz olaraq müharibəyə göndərirlər. Bir müddətdən sonra Əhəd müəllim müharibədə boğazından yaralanır, yarası ağır – ölümcül olduğundan onu yaşayış yerinə uyğun olaraq Bakıya hospitala göndərirlər. Bir ay müalicə alandan sonra onu evə buraxsalar da, həmin müddət rəhmətə gedir.



Əhəd müəllim valideynlərinə hospitalda yatarkən ona bacı kimi xidmət göstərən Manya, Sonya, Jenya adlı tibb bacılarından çox razılıq edər, xoş xatirələr danışarmış. Əhəd müəllim rəhmətə gedəndən sonra Xanlar əmi dünyaya gələn 3 qız övladına, oğlunun ruhu şad olsun deyə, həmin tibb bacılarının adlarını vermişdi.

***Hazırladı:*** **Dilafət RƏSULOV**

**YADDAŞ**



***Laçın rayonunun Məşədi Əzizbəyov adına kolxozunun sədri Bəhlul Hüseynov yoldaşa Laçın rayonunun Maksim Qorki adına kolxozunun üzvü Məhəmməd Səyyah tərəfindən***



***Bəhlul Hüseynov*** ***Məhəmməd Səyyah***

## ƏRİZƏ

Bizim taxılları yeyib çəyirtkə,
Sizin elə dən almağa gəlmişəm.
Yüzcə qram "atıb" tut arağından,
Şeir yazıb dəm almağa gəlmişəm.

Arzum budur gəzəm kolxoz bağların,
Əkin zəmilərin, otlaq dağların.
Ömrün sulu vaxtı, bu şən çağları
Bir balaca kam almağa gəlmişəm.

Səmədin "Dünya"sın oxudun mənə,
Nə bildin vurğunam mən də Vətənə?
Görürəm yorğunsan, nə deyim sənə,
Yoxsa dedin qəm almağa gəlmişəm?

Səyyaham, yolları yoraram özüm,
Çölləri bürüyər alovum, közüm.
Müxtəsəri budur sizlərə sözüm,
Kimdə saz var, sim almağa gəlmişəm.

***09.11.1970***

**Təqdim etdi: Akif HÜSEYNOV**

**DOST SÖZÜ**

## ÜMİDLƏ YAŞANAN ÖMÜR



Mən Qəni müəllimi qısa müddətdir ki, tanıyıram, amma mənə elə gəlir ki, onu həyatı dərk edəndən tanıyıram. Onun sadəliyi, insanpərvərliyi, həyatsevərliyi insanı valeh edir. Qəni müəllimdə yaxşı mənada bir qəribəlik də var. Onun gözlərində bir qəm-kədər duyulur. Maddi durumundan gileylənmir, özünün dediyi kimi nə qədər dəyərli dostları olsa da, nə qədər həyatsevər olsa da yurd həsrəti, Vətən sevgisi onu rahat buraxmır. Yaşlı insanlardan həmişə eşitmişəm ki, Allah-taala həmişə dərdini sevdiyi insanlara verir. Həyat onu üç qız övadının həyatdan vaxtsız getməsi ilə sınağa çəkib. O, yenə də Allahın yolunu saxlayır, namaz qılır, oruc tutur və bir də ona Məşəd ziyarətinə getməyə Allah-taala nəsib edib. Qəni müəllim sadiq dost, ən başlıcası insanlara dəyər verən bir insandır. Qəni müəllim nadan insanları sevmir. "Zər qədrini zərgər bilər" – onun ən yaxın dostlarından biri şəxsiyyətinə böyük hörmət etdiyim el ağsaqqalı, insanların əlindən tutmağı bacaran Dünyamalılar Bəylər dayıdır. Qəni müəllim boş vaxtlarında onunla keçmiş və gələcək haqqında söhbətlər edir. Qəni müəllim həyatın mənasını pulda, şan-şöhrətdə yox, yaxşı dostlarda görür. O, qeyd edir ki, mənim həyatda ən böyük qazancım dostlarımdır.

**Haşiyə:** Qəni Hüseynov (Qəmli) 1963-cü ildə Laçın rayonunun Narışlar kəndində dünyaya göz açıb. 1978-ci ildə Narışlar kənd məktəbini əla qiymətlərlə başa vuraraq elə həmin il Şuşa Pedaqoji Texnikumuna qəbul olub. 1982-ci ildə oranı bitirib. Kaha və Narışlar kənd məktəblərində müəllim işləyib. 1987-ci ildə indiki Azərbaycan Dövlət Pedaqoji Universitetinə daxil olaraq 1991-ci ildə həmin ali məktəbi bitirmişdir. Məlum hadisələrdən sonra Beyləqan rayonunun Türklər kəndində məskunlaşmış və orada da pedaqoji fəaliyyətini davam etdirmişdir. Eyni zamanda köçkün şagirdləri təhsilə cəlb etmək üçün orada ibtidai məktəb təşkil etmişdir.

Şeirə, sənətə gənc yaşlarından marağı olmuş, müxtəlif mətbuat orqanlarında – "Naxçıvan", "Fədai", "Zəngəzur", "Həkəri", "Laçın", "Müstəqil Respublika", "Mil" qəzetlərində və "Sözün Sehri", almanaxında şeirləri çap olunub. 2004-cü ildən mətbuat sahəsində çalışır. "Eko Media" qəzetində

müxbir, şöbə müdiri, baş redaktorun müavini işləmiş, "Laçın harayı" qəzetinin redaktoru olmuşdur.

Hal-hazırda "Yurd həsrəti" qəzetinin təsisçisi və baş redaktorudur. "Qarabağ həsrəti" şeirlər kitabının müəllifidir. 2010-cu ildə Milli Məclisin üzvlüyünə namizədliyi irəli sürülmüşdür. 2012-ci ildə "Alıyurdum Laçın dağım" kitabı çapdan çıxmışdır.

Qəni müəllimin qələmə aldığı yazılar mövzu baxımından müxtəlifdir. "Alıyurdum Laçın dağım" kitabında o, Laçın və digər işğal olunmuş rayonların tədqiqatını, yurd həsrətini, şəhidlər haqqında məlumatları, Azərbaycana sədaqətini və ayrı-ayrı mövzularda şeir və poemalarını vermişdir. Bu kitabda onun dostlarına ithaf olunmuş və dostlarının ona ithaf edilmiş şeirləri də yer almışdır. Onun şeirlərində Azərbaycan və azərbaycançılıq, qəhrəmanlar və yaradıcı insanlar da tərənnüm olunur.

Şair-publisist Qəni Qəmlinin yaradıcılığına həsr olunmuş tədbirdə qələm dostları iştirak etmişlər. "Quruluş" qəzetinin baş redaktoru, "Sözlü-sehirli dünya" ədəbi məclisinin sədri, Azərbaycan Yazıçılar Birliyinin üzvü Elman İsrafiloğlu, Beyləqan rayon Mədəniyyət evinin direktoru Cəbrayıl Məmmədov, şair İsa Zeynaloğlu, Rövşən Budaq, "Mil" qəzetinin əməkdaşı Baxşeyiş Şirinov, Beyləqan rayon İcra Hakimiyyətinin əməkdaşı Emin Quliyev, "Yurd həsrəti" qəzetinin əməkdaşları – şair Koroğlu Sönməz, Təşəkkür Quliyev, Araz Elsevər, qəzetin şöbə müdiri Kəmalə Rəhmanqızı, qəzetin zona müxbirləri Afət Gəncəli, Gültəkin Ağstafalı və başqaları çıxış edərək ürəyi daim yurd həsrəti ilə döyünən şair Qəni Qəmlini təbrik etmiş, ona cansağlığı, ailə səadəti, xoşbəxtlik və yaradıcılığında uğurlar arzulamışlar. Dünya Azərbaycanlıları Yazıçılar Birliyinin rəhbəri Rəşad Bəydəmirli, "Müstəqil Respublika" qəzetinin baş redaktoru Gülxas Səmədli, ATV-nin əməkdaşı Səxavət Sahil, "Həkəri" qəzetinin təsisçisi və baş redaktoru Əli Xankişiyev, "Zəmxarə" qəzetinin əməkdaşı Aşur Səsli, şairə Şəhla Şuşalı, "Yurd həsrəti" qəzetinin redaktor müavini Xanım Əliqızı telefon vasitəsi ilə ən xoş sözlərini çatdırmışlar.

2013-cü il martın 16-da isə Qəni Qəmlinin "Alıyurdum Laçın dağım" kitabının Beyləqan rayon Mədəniyyət Sarayında təqdimatı keçirilmişdir. Mədəniyyət və turizm şöbəsinin müdiri Nazim Mirzəyevin təşkilatçılığı ilə baş tutan təqdimat mərasimində Beyləqanın ədəbi ictimaiyyəti və bölgələrdən gələn qonaqlar neçə-neçə belə əsərlər ərsəyə gətirməsini müəllifə diləmişlər.

Qəni müəllim bu səmimi kollektivə və Beyləqan rayon İcra Hakimiyyətinin başçısı Vaqif Abdullayevə öz dərin təşəkkürünü bildirmişdir.

| | |
|---|---|
| *Vətən oğlu, çəkmə həsrət,* | *Zirvə çiskin, zirvə qardır,* |
| *Üzdü bizi, üzdü möhnət.* | *Böyük bir keçmişim vardır.* |
| *İtib abır, itib ismət,* | *Ana yurdum əsir qaldı,* |
| *Qayıt dağlara, dağlara*! | *Qayıt dağlara, dağlara.* |

– deyən qardaşımız, inşallah səninlə o dağlarda görüşərik.

Bu il sentyabrın 1-də Qəni Qəmlinin 50 yaşı tamam olur. Şübhəsiz ki, şair dostları onu yenidən təntənəli şəkildə təbrik edəcəklər. Mənim şair dostum, arzu edirəm sənin səsin yüksək kürsülərdən gəlsin. Sən bunlara layiqsən. Çünki sənin aşıb-daşan istedadın, Vətəninə, xalqına, dövlətinə olan məhəbbətin və bir də zəngin yaradıcılığın bütün bunlara imkan verir. Həm də gözəl ailə başçısısan, iki oğlan övladın var. Böyük oğlun Ramil ilahiyyatçıdir, ikinci oğlun təsərrüfatda çalışır.

Allahdan arzu edirəm ki, doğma Vətənin Laçın və işğal altında olan bütün torpaqlarımız azad olunsun. Sən də gedib o torpaqlarda yazıb yaradasan. Və bu mövzuların sırasına qələbə mövzusunu da qatasan. O gün uzaqda deyil, Qəni müəllim. Amin!...

Sizə uzun ömür, cansağlığı və yaradıcılıq uğurları arzulayırıq.

**Hüseynbala EYVAZOV,**
*Publisist*

**ALIN YAZISI**

## QƏHRƏMANLAR ÖLMÜRLƏR



Elçin Hüseyn oğlu Sadıqov 1967-ci ildə Laçında dünyaya göz açıb. Orta məktəbi bitirən kimi hərbi xidmətə çağırılıb. Hərbi xidmətdən valideynlərinə iki dəfə təşəkkür məktubu göndərilib.

Bakı Dövlət Universitetinin tarix fakültəsini bitirib. Əvvəl təhsil sahəsində çalışıb. Gənc Texniklər Stansiyasının direktoru, sonra Laçın rayon icra başçısının köməkçisi işləyib. Qarabağ müharibəsi başlayanda Elçin könüllü surətdə ərazi müdafiə batalyonuna yazıldı, səsi döyüş bölgələrindən gəldi. Vətən torpağının azadlığı naminə odlu-alovlu cəbhələrdən keçdi.

1995-ci il oktyabrın 28-də Bakı Metropolitenində baş verən faciə zamanı Elçin özünü hadisə yerinə çatdırdı. Neçə-neçə yurddaşımızı ölümün pəncəsindən xilas edib işıqlı dünyaya qaytardı. Lakin özü ölümün pəncəsindən

xilas ola bilmədi. Ömrünün bahar çağında dünyasını dəyişdi, şəhidlik zirvəsinə ucaldı. Elçin ölmədi, əbədiyyətə qovuşdu. Hələ neçə-neçə nəsillər onun bu qəhrəmanlığından söz açacaq, onun igidliyinin qarşısında baş əyəcəklər.

Özündən sonra iki övladı yadigar qaldı – Elgün və Gülü. Elçinin gülər üzü, xoş siması, şirin söhbətləri, qəhrəmanlığı heç vaxt yaddaşımızdan silinən deyil.

...O dəhşətli günü Validə Nəsirova belə xatırlayır: "Bakı Metropolitenində baş vermiş faciə zamanı kiçik yaşlı qızım Fərqanə ilə Əhmədlidən metronun "Nərimanov" stansiyasına gəlirdim. Həmin dəhşətli hadisə baş verdi. Vahimədən, qışqırtıdan qulaq tutulurdu. Qızım ağlayırdı, mən də özümü itirmişdim. Nə edəcəyimi bilmirdim. Addım atmağa taqətim qalmamışdı. Artıq ölümlə üz-üzə dayanmışdıq. Elə bu zaman cavan bir oğlan göz qırpımında qızım Fərqanəni qolları üstünə alıb, məni yerdən qaldırdı. Bir qədər sonra biz özümüzə gəldik. Cavan oğlan əlindəki alışqanla yolumuzu işıqlandırır və bizə ürək-dirək verirdi ki, qorxmayın, bacı, mən ölsəm də sizi burada qoymaram. O bizi metronun "Nərimanov" stansiyasına gətirdi. Qızımı və məni ölümdən qurtaran oğlana minnətdarlıq etmək üçün adını və haralı olduğunu soruşdum. Cavab verdi: "Bacı, haralı olmağın nə mənası? Azərbaycanlıyam, Elçin Sadıqovam. Bu mənim borcumdur. Yaxşı, sağlıq olsun, sonra görüşərik. İndi mən təcili geri qayıtmalıyam. Orada kömək lazımdır".

Elçin yenidən insanların həyatını ölümdən qurtarmaq üçün tunellə hadisə yerinə qaçdı. Bizi ölümdən qurtaran həmin oğlanın surəti bir gün də olsun gözümün önündən getmirdi. Fikirləşirdim ki, kaş xilaskarımızın özünü, ailəsini tapa biləydim. Onunla görüşəydim. Arada on gün xəstəxanada yatdım...

Bir gün qəzetdə Elçin Sadıqovun ölümünə görə başsağlığı verildiyini oxudum. Gözlərim qaraldı. Hələ də özümə gələ bilmirəm. Mənim üçün igidlik, mərdlik rəmzinə çevrilən xilaskarımın ölümünə heç cür inanmaq istəmirdim. Elçin bizi ölümdən xilas edəndə tuneldən çıxa bilərdi. Deməli, son nəfəsinədək darda qalanlara köməklik göstərib həlak olmuşdur. Allah rəhmət eləsin! Qəbri nurla dolsun! Sonra onu tanıyanlardan öyrəndim ki, 28 yaşlı Elçin Laçın rayon İcra Hakimiyyətinin başçısının köməkçisi işləyirmiş. Evliymiş, iki övladı qalıb. Ailəsi Günəşlidə yaşayır. Redaksiyadan xahiş edirəm ki, məni və qızımı ölümün caynağından xilas edən Elçin Sadıqovun ailəsinə ömürlük minnətdarlığımı çatdırasınız".

POEZİYA

İlham QƏHRƏMAN



## BÜLBÜL

Sən demə gül üçün can üzən quşun
Naləsi kədərin şövqüdü, bülbül.
Dünya qara geysin, bu oxuduğun -
Nə yaman yanıqlı şərqidi, bülbül.

Haqqın biz tərəfdən kəsildi rəddi,
Sevincim kədərin yanında pərtdi.
Gah təzyiqim yendi, gah ödüm artdı,
Bir yandan ciyərim bərkidi, bülbül.

Sevda ruhun cana eşq nəməridi,
O həm yox, həm də ki, yoxdan varıdı.
Desələr: çəkdiyin nədən sarıdı,
De bizə çəkdirən sevgidi, bülbül.

**28.09.2007**

## SEVGİ

Yenə sevgidi gələn,
Qoy gəlsin xətri xoşdu.
Üstümə qanad salar,
Qanadı, çətri xoşdu.

Tanrı xoş saatında
Məni yadına saldı.
Bundan gözəl yol varmı,
Sevgi ürəyə yoldu.

Təzələndim – elə bil
Dağlara qar ələndi.
Sevgisiz olan bəndə
Mürəkkəbsiz qələmdi.

## RAMİLİN LAÇIN HƏSRƏTİNƏ

Allah sənə insaf versin,
Versin, ay Ramil, ay Ramil!
Bizi kim qara yuyub, ağ
Sərsin, ay Ramil, ay Ramil!

Uduzmuşuq duzaqlarda,
Vətən qaldı uzaqlarda...
Şair it olsun, dağlarda
Hürsün, ay Ramil, ay Ramil!

Bu nə zaman, bu nə dövr,
Ürəyimdən keçəni gör,
Üzümüzü Laçında gor
Görsün, ay Ramil, ay Ramil!

## GİLEY

Quşuna dən atdım, gülün suvardım,
Dünyaya mən ayrı neynədim, qağa?
Yığıb düyünlədim ömrü qavğardım,
İçinə bir ağ gün düymədim, qağa.

Xəyalım dağ-aran – köçəri çəkdim,
Payıma düşəni peşəri çəkdim,
Hər şeyi dəniztək içəri çəkdim,
Dərdimi kimsəyə demədim, qağa.

Qələmim bilmədi yasaq, tabular,
Fürsət eyləsələr başım çapılar.
İlham Qəhrəmandan az-az tapılar,
Mən şair çörəyi yemədim, qağa.

**31.10.2009**

**PUBLİSİSTİKA**

**İmdad ƏLİZADƏ**



## QÜRBƏTƏ SARI
### II yazı (ardı)

Sahilində məskunlaşdığımız çayın adı Kürəkçay idi. Mənbəyini Murovun qarlı yüksəkliklərindən, dağlardan alır. Çay bol sulu və gur idi.

Traktordan düşdük, anam çayı keçib yanımıza gəldi, bizi bağrına basdı, ağladı. Onu görəndə üzümüz güldü, sevincimizin həddi-hüdudu yox idi. Axı bizim anadan ayrı düşmək yaşımız deyildi, böyüyümüzün 13, kiçiyimizin 4 yaşı vardı. Mənim 12 yaşım təzəcə tamam olmuşdu. Ana nəvazişi üçün çox darıxmışdıq…

Atam bizi çaydan keçirdi. Traktor çayı adlayıb alaçıqlar qurulan yerə gələ bilmədi, əşyaları boşaltdılar. Qohumlar əşyaları çaydan keçirməyə kömək etdilər.

Çaydan bir qədər aralıda böyük bir daşın dibini yurd yeri seçdik, humanitar yardım kimi verilən çadırı qurduq. Hərbçilər üçün səhra çadırı idi. Qohumlar kömək edirdilər, ancaq alaçığın qurulması əziyyətlə başa gəldi və xeyli vaxt apardı. Axşam düşürdü, çadırın içini rahatlaya bilmədik, yamacı qazıb düzəltmək sabaha qaldı. Əşyaları çadıra yığdıq. İndi bura bizim evimiz idi. Yataq otağı, qonaq otağı, yemək otağı, mətbəx – hamısı bu humanitar yardım çadırından ibarət idi. Amma atam haqlıydı, hər halda bu bizim özümüzə məxsusuydu.

Anam yemək bişirdi. Bir aydan artıq davam edən ayrılıq sona çatmışdı, çıraq işığında süfrə başına toplandıq. Nənəm Allaha şükür edib dedi ki, nə yaxşı sağ-salamat bir yerə yığıla bildik: “Öz çörəyimiz, öz süfrəmizdir, gərək adamın başını daldalamaq üçün bir yeri olsun. Bu günə də şükür, nə qədər kiminsə yanına sığınmaq olar…”

***

Anam kənddən necə çıxdıqlarını, yolda başlarına gələn faciələri danışdı. Məni yola salandan sonra Oğuldərədə bir gün qalmışdılar: “Kişilər Arif Zülfüqarovun evinin qarşısına yığılıb məsləhətləşdilər. Dedilər ki, Laçın işğal olunub, Azərbaycan ordusu öz mövqelərini tərk edib, ermənilər hər an Oğuldərəyə gəlib çıxa bilərlər. Ona görə də kənddə qalmaq təhlükəlidir.

Kənddən çıxmaq qərarına gəldik. Mal-qoyunu örüşə ötürmüşdük, bir neçə nəfər gedib heyvanları yığıb gətirdi. Atları yəhərlədik, evdən bir yorğan, çörək və bir qədər də un götürdük, mal-qoyunu yığıb kənddən çıxdıq.

Hamı ağlayırdı, isti ev-eşiyimizi, doğma kəndimizi tərk etmək asan deyildi. Həmin gün Sarıyoxuşa gəldik. Burada insan, heyvan əlindən tərpənmək mümkün deyildi, Laçının mərkəzi tutulduğuna və Laçın-Qubadlı yolu bağlandığına görə kəndlərdə qalan insanlar Kəlbəcər istiqamətinə üz tutmuşdular. Qorçu, Zağaltı kəndlərindən tanış olan xeyli adam gördük. Kəlbəcərin Tirkeşəvənd kəndinin yaxınlığına gəldik. Köçü orada tökdük, gecəni orada qaldıq.

Həmin gün atanız gəlib çıxdı. Soraq edə-edə gəlib bizi tapmışdı. Ev əşyalarını çıxarmaq üçün maşın gətirmişdi. Dedi ki, gedək kəndə, əşyaları yığaq. Arif, Fatimə, Mötəbər, Güləbətin, Təvəkkül, Ağaşirin, Məmmədalı, Cənnət maşına mindilər. Onlar da kənddən ev əşyalarını gətirməyə gedirdilər. Kəndə yollandıq. Sarıyoxuşu aşanda Lolabağırlı kəndinin güneyində yolun içində bir maşın durmuşdu. Bizim sürücü istədi ki, dayanmış maşının yanından keçsin, elə bildi yol yaxşıdır. Amma maşın uçuruma düşdü, adamların qışqırtısı göyə qalxdı. Maşın bir qədər silkələndi, amma uçurumdan çıxdı. Təhlükədən sağ qurtardıq. Əvvələr bu dağlardan baxanda kəndlərdən işıq gəlirdi. Yollarda maşınların ardı-arası kəsilmirdi. İndi dağlar sanki yas içindəydi, hər yer səssizlik idi.

Axşam kəndə çatdıq. Kənd min ilin xarabalığına oxşayırdı, heç kim yoxuydu. Maşın evdəki bütün əşyaları yığmaq üçün kifayət edirdi. Amma qonşularımız da evdən heç nə aparmamışdı. Ona görə də maşına çox az şey yığdıq. Bir neçə ailənin əşyalarından da götürdük və kənddən çıxdıq. Səhərə yaxın Tirkeşəvəndə çatdıq. Maşın Tərtərin Hüsənli kəndinə gedirdi. Atanız dedi ki, sən maşınla get, mən mal-qoyunu gətirim, razı olmadım. Tirkeşəvənddə maşından endim.

Mal-qoyun otlaması üçün sahə yox idi. Yerimizi dəyişməyə məcbur olduq, çayı keçib güneyə adladıq, meşənin içində köçü tökdük.

Gecəni orada qaldıq. Tikili yox idi, çadır qurmaq imkanımız olmadı. Yorğanı üstümüzə atıb yatdıq. Gecə güclü qar yağdı, şaxtadan donmuşduq, yorğanlarımız su idi. Ocaq qaladıq, xeyri olmadı, soyuq bizi taqətdən salmışdı. Şaxta, boran, qar mal-qoyunu qırırdı.

Səhər açıldı. Yanımıza bir neçə nəfər gəldi. Oğuldərəlilərin Kəlbəcər rayonundan olan qohumlarından idi. Bizə meşə yuxarı getməyi, meşənin ortasında olan mağarada daldalanmağı məsləhət gördülər. Əşyaları atlara yüklədik, mal-qoyunu yığıb mağaralar olan əraziyə gəldik. Bura bizdən əvvəl köç düşmüşdü, bir hissəsi oğuldərəlilər idi. Çətinliklə mağarada yerləşdik və iki gecə burada qaldıq.

Sulu qar yağdı. Mağaraya su doldu, yorğanlarımız, paltarımız yaş oldu, dəyişmək üçün əlavə paltar yoxuydu, vəziyyət ağır idi. Çörəyimiz qurtarmışdı. Unumuz olsa da, çörək bişirmək imkanı yoxuydu. Mal-qoyun da acından qırılırdı. Köçməyə məcbur olduq. Kəlbəcərin Qoşnallar kəndinin yaxınlığına gəldik. Bu kənddə oğuldərəlilərin qohumları yaşayırdı. Acından ölürdük, yemişan ağacının yarpaqlarını yeyirdik. Bir neçə nəfər un götürüb getdi. Evlərdən birində çörək bişirib gətirdilər. Çörək yeyib toxtadıq. Bir gecə də burada qaldıq, yorğana bürünüb yatdıq.

Səhər yenə yerimizi dəyişdik, kənddən yuxarıda olan dağlara qalxdıq. Burada heyvanlar üçün ot vardı. İki gün də burada qaldıq. Yenə nə bir tikili vardı, nə də alaçıq qura bildik. Yorğana bürünüb çöldə yatırdıq. Burada ərzağımız, çörəyimiz qurtardı.

Oğuldərəyə gedib qayıdanlar vardı. Bildirdilər ki, nə Oğuldərədə, nə də qonşu kəndlərdə erməni var. Ona görə də kəndə qayıtmaq qərarına gəldik. Atları yükləyib, mal-qoyunu yığıb yola düşdük. Oğuldərə ərazisində Pəri bulağı adlanan əraziyə gəldik. Burada xeyli gicitkən, yarpız yığıb yedik, bir az toxtadıq. Günorta kəndə çatdıq. Xəmir yoğurub çörək bişirdik.

Axşama yaxın Aşağı Haçayalda bir dəstə adam göründü. Əvvəl elə bildik ki, ermənilərdir, qorxduq. Bir qədər yaxınlaşdan sonra məlum oldu ki, aralarında qadınlar da var. Belə qənaətə gəldik ki, azərbaycanlılardır. İki kişi, iki qadın və 12-13 yaşında əlil bir oğlan idi. Laçının Katos kəndinin sakinləriydi. Dedilər ki, ermənilər qəfildən hücum etdilər, çətinliklə qaçıb kənddən çıxdıq. Ermənilər bir neçə nəfəri qətlə yetirmişdilər, əsir aparmışdılar. Ev əşyasını, mal-qoyunu çıxara bilməmişdilər. Bir neçə gün ac-susuz yol gəlmişdilər. Uşaq açlıq-susuzluqdan ağır vəziyyətə düşmüşdü. Çörək verdik. O yedikcə alman faşistlərinin ölüm düşərgəsindən çəkilən filmlər gözümün qabağına gəldi.

Gecə Oğuldərədə qaldılar. Növbəti gün Kəlbəcər istiqamətində getdilər.

Biz isə kənddə qaldıq. Katosdan gələnlərin ermənilərin hücuma keçməsi haqda dediklərinə inanmadıq.

Kəndə bizdən başqa da qayıdanlar vardı. Bir həftə kənddə olduq, iki axşam öz evimizdə, dörd gecə Arif Zülfüqarovun evində qaldım. Evdə təmizlik işləri apardım, xalça-palazı çayda yudum. Amma rahatlıq tapmaq mümkün deyildi, ailə yox, uşaqlar yox. Hücum təhlükəsindən adamın gözünə yuxu getmirdi.

Ayın neçəsi olduğu yadımda qalmayıb, gecə saat on radələri olardı. Dayım İbrahim İbrahimov qışqırdı ki, ermənilər gəlir, qaçın. Mal-qoyunu töv-

lədən açdıq, çətinliklə kənddən bir qədər uzaqlaşdıq. Zülmət qaranlıq idi, göz-gözü görmürdü, yerimək mümkün deyildi.

Sarıyoxuşda dayandıq, gecəni burada qaldıq. Hava soyuq idi, yorğana bürünüb çöldə gecələdik. Səhər açılanda məlum oldu ki, bataqlıq ərazidə qalmışıq, yatdığımız yer bataqlıq olub.

Yola düşdük, Sarıyoxuş dağına qalxdıq. Buradan Laçının kəndləri aydın görünürdü. Ermənilər Qurdqajı, Ərikli, Piçənis, Hacısamlı kəndlərini işğal etmişdi, evləri yandırmışdılar, dağları tüstü bürümüşdü, döyüş gedirdi, güllə səsindən qulaq tutulurdu.

Yenidən Qoşnallar kəndinin yaxınlığına gəldik, köçü burada tökdük. İki gün burada qaldıq. Temir İbrahimov, Arif Zülfüqarov, Mötəbər İbrahimov dedilər ki, Oğuldərəyə gedirik. Kənddə vəziyyətin necə olduğunu, ermənilərin harada dayandığını bilmirdik. Ona görə də kəndə getmək təhlükəliydi. Hamımız onların kəndə getməsinə etiraz etdik. Lakin bizi dinləmədilər, atları minib getdilər.

Gecə qaranlıqda qayıtdılar. Dağlarda gizlənə-gizlənə kəndə getmişdilər. Dedilər ki, ermənilər Oğuldərəyə girib evləri yandırıb qayıdıblar. Oğuldərədə otuza yaxın ev yandırmışdılar. Amma kənddə qalmamışdılar.

Hansı istiqamətdə getmək məsələsində fikir ayrılığı yaranmışdı. Bir qrup kəndə qayıtmağı, bir hissə Kəlbəcər ərazisində qalmağı, bir qrup isə Murov dağını aşıb Xanlar (indiki Göygöl) rayonuna getməyi təklif edirdi. Hara köçmək məsələsində iki günə ancaq razılıq əldə olundu.

Murovu aşıb Xanlar (indiki Göygöl) rayonu ərazisinə keçmək qərarına gəldik. Köçü, mal-qoyunu yığıb yola düşdük. Ərzağımız, çörəyimiz qurtarmışdı. Hava yağışlı və soyuq idi. Bir kəndin yaxınlığında dayandıq. Güləbətinlə birlikdə bir evin qarşısına getdik. Həyətdə təndir yandırıb çörək bişirirdilər. Təndirin kənarında dayanıb isindik, yaş paltarlarımızı qurutduq. Bizə bir çörək verdilər. Pulla çörək satmalarını istədik, amma əlavə vermədilər.

Çörəyi qaldığımız yerə gətirdik, bir təndir çörəyini on beş nəfər arasında böldük, hərəyə bir tikə düşdü. Gecəni burada qaldıq.

Səhər yola düşdük. Bir qədər gəldikdən sonra hərbi posta çatdıq. Hərbçilər bizi buraxmaq istəmirdi. Pul yığıb verdik, buraxdılar. Bir çayın qırağı ilə getdik. Hava soyuq idi, yağış yağırdı, dumandan heç haranı görmək mümkün deyildi. Burada Xasay İbrahimov sürüşüb yıxıldı, qolu çatladı.

Gəlib bir yerdə dayandıq. Meşənin ortasında köçü tökdük. Sulu qar yağırdı, hava duman-çiskin idi. Ocaq qaladıq. Artıq iki gün idi çörəyimiz qurtarmışdı. Burada bir qoyun kəsdik, əti közdə bişirib yedik. İnəkləri sağıb

horra bişirdik. Gecə burada qaldıq. Sulu qar yağırdı. Yorğana bürünüb ocağın kənarında yatdıq.

Səhər açıldı. Yaxınlığımızda bir köç düşmüşdü. Onların yanına getdik. Məlum oldu ki, Laçının Qorçu kəndindəndirlər. Çörək bişirirdilər. Ələk alıb apardıq, un ələdik. Amma çörək bişirməyə sacımız yoxuydu. Qorçulu onların sacında çörək bişirməyimizə icazə vermədi. Ac-susuz yola düşdük. Hava açıldı, gün çıxdı. Gəlib bir binəyə çıxdıq. Mal binəsi idi, iki qadın və bir kişi mal-qoyun saxlayırdı. Onların yanına getdik. Xəmir yoğurmağa qazan, çörək bişirməyə sac istədik. Verdilər, çörək bişirdik, yeyib toxtadıq.

Burada qalmadıq, yola düşdük. Bir kəndin yaxınlığına gəldik, köçü tökdük. Xasay İbrahimov xəstələnmişdi, həm də qolu sarıqlı idi, orada qala bilmədi. Yaxınlıqdakı kəndə getdi, bir evdə qalmışdı. Gecə qaldığı evdə cibindən pulunu çıxarmışdılar.

Oradan köçüb Zallar kəndinin yaxınlığına gəldik. Burada üç gün qaldıq. Artıq Murovun ətəyinə çatırdıq. Atanız gəldi. İki torba çörək alıb gətirmişdi. Yenidən hansı istiqamətdə getmək məsələsində mübahisələr başladı. Kəndə qayıtmağa qərar verdilər. Köçü, mal-qoyunu yığıb Oğuldərəyə qayıtmaq üçün yola düşdük. Kəlbəcərin Qamışlı kəndinə çatanda Oğuldərədən bir neçə nəfərlə qarşılaşdıq. Oğuldərəyə qayıtmağımıza etirazlarını bildirdilər. Dedilər ki, kəndi ermənilər yandırıb, ermənilərin harada dayandığı məlum deyil, getmək təhlükəlidir.

Bundan sonra Oğuldərəyə qayıtmamaq qərarına gəldik. Mal-qoyun heydən düşmüşdü, yeriyə bilmirdi. Ona görə də Qamışlıda bir neçə gün dayandıq. Malı maşına yığdıq. Qoyunu isə yolla gətirib Murovun ətəyinə çatdıq. Burada malı maşından tökmüşdülər. Qarlı və soyuq Murovu aşmalıydıq. Murovun ətəyində köçü tökdük. İnsanlar yaylağa çıxmışdı, yaxınlıqda alaçıqlar vardı. Güləbətin bir alaçığa gedib ləyən, ələk, sac alıb çörək bişirdi. Gecəni burada qaldıq, səhər yola düşdük. Yol üçün götürdüyümüz çörəyi inəklərə verdik, aclıqdan, uzaq məsafə gəlməkdən taqətdən düşmüş malları çörəyin hesabına Murov dağından aşırdıb Xanlar (indiki Göygöl) ərazisinə gəldik.

Murovun ətəyində meşənin qırağında köçü tökdük. Burada yenidən hara getmək məsələsində fikir ayrılığı yarandı. Bir neçə adam mal-qoyununu maşınlara yığıb müxtəlif rayonlara getdilər. Biz isə burada qaldıq. Alaçıqlar qurduq, ay yarımdam sonra başımızı daldalamaq üçün bir yerimiz oldu".

Anamın yolu belə ağır olmuşdu...

**DÜNYA ƏDƏBİYYATI**

**Robin ZİGER**

# ZƏFƏR ÜÇÜN DOĞULANLAR
**(davamı)**

## BEYNİMİZ

*Yaxşı bir ağla sahib olmaq yetərli deyildir;*
*önəmli olan ondan yaxşı yararlanmaqdır.*
**Röne Dekart (1596-1650),**
***fransız filosofu***

Ən böyüyündən ən kiçiyinədək bütün başarılar insanın xəyal gücündə bir fikir olaraq doğulmuşlar. Biz görüntülər halında düşünür və xəyal edirik. Xəyal və görüntülərsə yalnızca bizim zehnimizdədirlər, o üzdən bu məşhur boz maddəmizə bir nəzər salmağa dəyər. Əslindəsə beynimiz südlü qəhvə rəngindədir.

Beyin barədə çox şey yazılmışdır, ancaq yenə də o bədənin ən az anlaşılan bir qismidir. Mütəxəssislər onun potensialının yalnızca yüzdə 5-ni qullandığımızı, genetik irsiyyətin intellektual prosesimizin yüzdə 50-sini açıqlaya bildiyini, qalan yarısınısa hələ inkişaf etdirib kontrol edə biləcəyimizi söyləyirlər.

Beynimiz ən qarmaşıq orqanımız olmaqla yanaşı dünyada ən çox təkamül etmiş bir orqandır. O, yaşayan bir maddədir, özünü yeniləmə qabiliyyətinə malikdir. Girişi daim açıqdır, çalışmasını əsla kəsməz. O, təbiətin ən böyük yaratdığı olsa da, heyif ki, yanında bir istifadə təlimatı verilməmişdir.

Beyin üç bölümdən oluşmuşdur: beyin kökü, beyincik və əsl beyin. Təkamül baxımından aşağı-yuxarı 270 milyon il öncə beynin ilk hissəsi – beyin kökü indiki halına gəlmişdir. İlk quru heyvanları sürünənlər olmuşlar və ilk təməl hissə olan kök "sürünən beyni" kimi tanınır. Nəfəsalma və ürəyin döyünməsi kimi təməl günlük işləri yerinə yetirməklə yanaşı fiziki duyuşlardan gələn bilgiləri də kontrolda saxlayır. Düşünmə və hissetmə vəzifəsi və ya hissiyyat mərkəzi yoxdur – bu da kərtənkələlərin öz balalarını nədən yeyə bildiklərini və niyə sevimli bir ev heyvanı olmadıqlarını anladır.

Daha sonrakı – haradasa qırx milyon il sonrakı – təkamül mərhələsi beyin kökünün arxasında duran və olduqca qart bir gül kələminə bənzəyən beyincikdir. Funksiyası müvazinəti saxlama və ya şüurun iştirakı olmadan əl-ayağımızın hərəkətini və əzələ yaddaşını inkişaf etdirib əlaqələndirməkdir.

Üçüncü bölüm – haradasa 160 milyon yaşındakı – əsl beyindir, “məməli beyni” kimi tanınır; düşünmə və duyğu bölgəmizdir. Onun bir sıra özəllikləri insanlar olaraq bizi fərqli edən qabiliyyətləri ehtiva edirlər.

Limbik sistem təxminən 150 milyon il öncə inkişafa başlamış və inkişafı heyvan növləri arasında sosial işbirliyi yaradılmasını təmin etmişdir. Bu sistem, bədənlə ağıl arasında kollektiv şəkildə bir ATS vəzifəsini yerinə yetirən beş hissədən ibarətdir.

İlk bölüm olan hippocampus (ağ çıxıntılar) beynin hafizə mərkəzidir. Bu, qısa müddət və bir az daha uzun müddət ərzində xatırlanmalı olan şeylərin keçici saxlanc yeridir. İnsan iki yaşına çatanadək tam inkişaf halına gəlmiş olmur. Körpəlik çağı ilə bağlı xatirələrin olmamasını bununla izah edirlər.

Sonrakı bölüm, duyğulu xatirələrin emalı ilə məşğul olan amiqdaladır. Hər bir xatirənin nə qədər duyğu təsirinə malik olacağına qərar vermək üçün düşünən beyinlə birgə çalışır. Əgər amiqdalanız cərrahi yolla götürülmüş olarsa, eynən kərtənkələlər kimi heç bir duyğu reaksiyanız olmazdı.

Verilən mesajları hipofiz vəzinə ötürmək yolu ilə hormonların ifrazını başladan, bədənə fərqli durumlara necə təpki verəcəyini anlatmaya yardımçı olan hipotalamus amiqdala ilə yaxından əlaqəlidir. Qorxulu bir durumda qanınıza “savaş, ya da qaç” reaksiyasını törədən adrenalin buradan ifraz olunur.

Daha sonrakı bölüm, işinin bir qismi (qoxudan başqa) duyğu orqanlarından sürəkli gələn mesaj axınından məna çıxarmaq olan talamusdur. Son olaraq da noxud böyüklüyündə bir nəsnə olan, hormon kontrolu yolu ilə hormon sistemimizdəki digər vəzlərə nə edəcəklərini anladan hipofizimiz gəlir. Biz yuxarıda beynin quruluşu və duyğusal fəaliyyəti ilə bağlı çox bəsit bir açıqlama verdik.

Şüurlu düşüncəsə indi və buradakı əqli ayırdetmə durumudur. Bu kitabı oxumaq şüurlu bir əməldir. Bunun tam olaraq fərqindəsiniz və bu əməl tam şəkildə sizin nəzarətinizdədir. Şüurlu düşüncə ayırd etmə (fərqində olma) və seçimlə bağlıdır. Və bizi taysız, misilsiz bir növ edən şey, bilgini saf-çürük etmə, yaddaşda saxlanılan verilərdən və o andakı təcrübədən istifadə etməklə qərar vermə qabiliyyətidir.

***Tanrım, mənə dəyişdirə bilməyəcəyim şeyləri qəbul etməm üçün təmkin, dəyişdirə biləcəklərimi dəyişdirməm üçün cəsarət və aradakı fərqi anlamam üçün müdriklik ver.***

**Reynhold Nibur (Niebuhr) (1892-1971),**
***amerikan teoloqu***

Şüuraltı ömür boyu duyğularımızın topladığı bütün təcrübələri bir yerə yığıb nizama salır və gələcək istifadələr üçün saxlayır. Bədənimizin hər bir funksiyası hər an nizamlanmaqdadır. Hipnozun bunu göstərdiyi kimi, şüuraltı ürəyin döyüntülərini azaldacaq, bədən hərarətini düşürəcək və hətta vücudumuzun çeşidli bölgələrini keyləşdirəcək şəkildə proqramlana bilir.

Özümüzü yaxşı hissetmə, güvən, xoşbəxtlik və məmnunluq duyğumuzu təyin edən beynimizdir. Əski bir atasözü vardır: "ürək üçün yaxşı olan baş üçün də yaxşıdır". Beyin ürəyin vurduğu qanın yüzdə 25-nə ehtiyac duyur. Beyin üçün yeganə enerji qaynağı qan şəkəridir və o, öz enerjisini özündə yığıb saxlamadığına görə bol enerjili və oksigenli, düzgün bir qan dövranına möhtacdır.

Qaydalar sadədir. Qan, içində aşırı yağ olduğu zaman rahat dolaşa bilmir, bu üzdən az yağlı qidaları seçin. Aclıq rejiminə başlamayın; yalnızca daha az və daha tez-tez yeyin və az kalorili ərzaqları seçin. Aclıq rejimi təhlükəli bir seçənəkdir, çünki qan şəkəri səviyyəsini kəskin şəkildə aşağı salır. Beyninsə yeganə yanacağı şəkərdir.

Şübhəsiz, hər şeyi dəyişdirə bilməzsiniz. Əlimizdən gələnin ən yaxşısını etməyimiz gərəkdiyini təqdir etməliyik, fəqət kontrolumuzun dışında olan sərhədləri və məhdudiyyətləri qəbul etməli və ən önəmlisisə dəyişdirə biləcəyimiz və dəyişdirə bilməyəcəyimiz şeylər arasındakı fərqi bilməliyik.

*Düşüncələrinizə diqqət edin; sözlərə çevrilərlər.*
*Sözlərinizə diqqət edin; əmələ çevrilərlər.*
*Əməllərinizə diqqət edin; vərdişə çevrilərlər.*
*Vərdişlərinizə fikir verin; xarakterə çevrilərlər.*
*Xarakterinizə diqqət edin; taleyinizə çevrilərlər.*
**Frank UTLOU (Outlaw)**



*Səlcuq türkcəsindən uyğunlaşdıranı:*
**Yusif OTAYLI**

**XATİRƏ**

# ИЛК МЦЯЛЛИМЯМ

Сентйабр айы йахынлашанда щяр бир евдя йцксяк ъанланма щисс олунурду. Бцтцн валидейнляр ъошгунлугла dərslərин башланмасыны эюзляйир, хцсуси бир щявясля щазырлыг ишляриня башлайырдылар. Дцкан-базара эедир, мяктябя эедян ювладлары цчцн пал-палтар, чанта, дяфтяр-гялям вя мяктябли лявазиматлары алырдылар.

Мян дя I синфя эедяъякдим. Атамэил дя мяня лазым олан мяктяб яшйаларыны алмышдылар. Щяля ахшамдан анам баьымыздан ъцрбяъцр чичяклярдян бир дястя йыьараг суйа гоймушду. Атамла анам арасында эедян сющбятдян ешитдим ки, истяйирляр мяня ибтидаи синиф мцяллими Йасямян мцяллимя дярс десин. Йасямян мцяллимя савадына эюря кянд ящалиси арасында бюйцк нцфуз газанмышды.

Мяктябя эетмяк, охумаг, биликляря йийялянмяк мясулиййяти мяни щяйəъанландырырды. Нящайят, 1 сентйабр эялди. Севинъим йеря-эюйя сыьмырды. Мяктябли формасында ата-анамла бирликдя мяктябя эялдиm. Ялимдя эцл дястяси вя дяфтяр-гялям йыьылмыш чанта вар иди. Атамэил еля севинирдиляр ки, бялкя дя щямин эцн онларын хатириндя ян дяйярли эцнлярдян бири иди.

Мяктябин эениш щяйяти кичикли-бюйцклц шаэирдлярля, мцяллимлярля вя валидейнлярля долу иди. Шаэирдляр щамысы мяктябли формасында – гызлар гара рянэли палтар вя аь юнлцкдя, оьланлар ися гара костйум və аь кюйнякдя идиляр. Октйабрйатлар, пионерляр вя комсомолчулар бир-бирляриндян фяргляниrдиляр. Пионерлярин нишанлары вя галстуклары, комсомолчуларын ися комсомол нишанлары вар иди. Октйабрйатларыn да юз нишанлары вар иди. Мяктябдяки бу ъанланма, издищам, севинъ бцтцн кянди сармышды. Мцщарибя ветеранлары, аьсаггал бабалар, аьбирчяк няняляр дя бу мяктяб шянлийиндя иштирак едирдиляр. Тябрикляр, чыхышлар, ушаглара вя эянъляря верилян хейир-дуалар ян мцгяддяс кяламлар кими сяслянирди. Йашлылар бу хейир-дуалары вермяйи санки юзляриня боръ билирдиляр. Зящмяткеш, мцщарибяnin аьрыаъысынı эюрмцш, лакин сималарына хейирхащлыг, мярданялик, дцзэцнлцк чюкмцш бу инсанларын нурани сифятляриндян бизя гайьы, диггят, мясулиййят, севинъ йаьырды. Онлар неъя дя щявясля щяр биримизи данышдырыр, сюзляримизя гулаг асыр вя башымызы сыьаллайараг бизя хейир-дуа верирдиляр. Йахшы охумаьы, халга, Vятяня лайигли ювлад олмаьымызы тювсийя едирдиляр.

Bayram tядбирi баша чатандан сонра бюйцк синифляр юз йерлярині tutdular. Анамын ялиндян бярк-бярк тутмушдум. Еля билирдим ки, анам евя эедяндян сонра щямишялик бурада галаъаьам. Valideynlərim мяктябдя мцяллим ишляйирдиляр. Бюйцк баъы-гардашларым мяктябдя тящсил алырдылар.

Биринъиляри сырайа дцзцб синифляря бюлдцляр. Ики паралел синиф йаранды. Щярясиндя 30-32 няфяр шаэирд вар иди. Мяним охудуьум синиф 1[а] синфи иди. Щяр синфя айры-айры мцяллим дярс дейяъякди. Мян Гарыгышлаг кянд орта мяктябинин габагъыл синиф мцяллимляриндян бири олан Йасямян мцяллимянин синфиндя охуйаъаqдым.

Йасямян Гурбанова 1923-ъц илдя Гарыгышлаг кяндиндя колхозчу аилясиндя анадан олмушдуг. Аилядя ики баъы олублар .Щяр икиси тящсил алмышды. Чимназ хала агроном иди.

Аиля оъаьы даьылдыгдан сонра оьлу Ящмядля бирликдя атасыэилдя йашайырдылар. Ящмяди тякбашына бюйцдяряк али тящсил алмасына наил олду. О, уъабойлу, гарайаныз, назик бир гадын иди. Нямишя сялигяли эейинірди, сачларыны ортадан таь айырараг бойнунун ардында санъаглайıрды. Синифдя щямишя ъидди эюрцнüрди. Бизи синфя йыьыб парталарда яйляшдирди. Адымызы, доьум тарихимизи, кимин ювлады олдуьумузу сорушуб юз гейд дяфтяриня йазды. Щяр биримизя юз йеримизи танымаьы тапшырды.

Йасямян мцяллимя илк дяфя гялям тутмаьы, щярфlərі йазмаьы бизя юйрятди. Няр бир шаэирдин гялями дцзэцн тутмасы, щярифляри сялигяли вя айдын йазмасы цчцн вар гцввяси иля чалышырды. Артыг 1-ъи рцбдя китабы сялис вя интонасийа иля охуйурдуг. Йасямян мцяллимянин щям дя мялащятли вя цряйяйатан сяси вардı. Мусиги дярсляриндя ону динлямяк чох эюзял иди. Илк эцндян шаэирдляря дцз данышмаьы, ядяб вя мярифят гайдаларыны юйрядирди. Йалан данышан шаэирдляри щямишя айаг цстя сахлайар, дцз данышмайана гядяр отурмаьа иъазя вермязди. Оьланлара гызлара щюрмят етмяйи юйрядяр, валидейнлярля сых ялагя сахлайарды. Демяк олар ки, мяним щаггымда даима атама мялумат веряр вя мяним чох ядябли вя габилиййятли, тябиятян чох сакит шаэирд олдуьуму дейярди. Амма мяни щеч вахт синифдя тярифлямязди, бунун мянасыны сонралар баша дцшдцм. Щямишя синифдя дейярди ки, адамы цзцня тярифлямязляр, онда щямин адамдан йахшы нятиъя эюзлямяк олмаз.

Йасямян мцяллимя ибтидаи синифлярдя бизи еля юйрятмишди ки, бюйцк синифлярдя мцяллимляр чох язиййят чякмирдиляр. Ялифба вя

щярфляри, китабы цзцня сялис охумаьы, шеiрляри язбяр сюйлямяйи, вурма ъядвялини, рийазиййаты вя диэяр фянляри бизя дяриндян юйрядирди. Атама мяндян разылыг етдийиня эюря атам эизли олараг дярсляря ъавабыма диггят йетирирмиш. Ъавабларым мцяллимяни еля севиндирdi ки, юзцнц сахлайа билмяди вя атамы сясляди. "Ай Ибиш мцяллим, мяня инанмырдын, шащиди олдун ки, Ряфигя щягигятян дярс ялачысыдыр?" Хяттими эюстяриб дейирди ки, еля бил мунъуг дцзцб, эюзял хятти вар.

Сонралар ешитдим ки, гызы олмадыьына эюря мяни гызлыьа эютцрмяк истяyib, amma атам разы олмайыб. Юзц иля бирэя мцяллим ишляйяндя шикайятляниб дейирди ки, о вахт атан сяни мяня вермяди, мян дя сяня ана кими олаъагдым. Кюнлцнü алыб дейирдим ки, мян щям дя сянин гызынам.

Евляри биз тяряфдя – "Гызлар булаьы"нын цст тяряфиндя мянзяряли бир йердя иди. Мяктяб йолумуз демяк олар ки, бир иди. Дярсдян сонра атасына вя оьлуна гайьы эюстярирди. Гайьыкеш ана вя лайигли ювлад иди мцяллимя. "Виъдан щаггы" кялмяси дилинин язбяри иди. Виъдан еля бир анлайышдыр ки, щяр бир инсана шамил олуна билмяз. Доьруçул, гайьыкеш мцяллимя "Vиъдан щаггы" демякля инсанлыьын ян йцксяк амалы олан виъданы санки наданлара, виъданыны итирянляря хатырладырды.

1992-ъи илдя о да аиляси иля бирликдя кючкцн олараг Бакынын Мярдякан гясябясиндяki ушаг баьчаларынın бириндя йерляшди. Бир мцддят мцяллимя ишляди. Сонра узун мцддят хястя йатды, 96 йашында дцнйасыны дяйишди. Ян дящшятлиси ися оьлу Ящмяд мцяллимин онун юлцмцня дюзмямяси олду. Анасынын юлümцнцн гырх эцнц тамам олмамыш Ящмяд мцяллим йатыб айылмады. Щяйатда мейиллярини бир-бигиня салан бу ана-баланын талеляри беля йазылмышды.

Аллащ щяр икисиня рящмят елясин! Йасямян мцяллимя щяр бир шаэирди цчцн ясл ана, мцяллим иди. Онун хатиряси ону севянлярин гялбиндя щямишя йашайыр вя йашайаъаг.

Сян гялям тутмаьы юйрятдин мяня,
Ана кялмясини йаздырдын мяня.

Йанан мяшял олдун кюрпя нясиля,
Виъданлы, доьруçул илк мцяллимям.

Илляр бир-бирини явяз ейляйир,
Юмцрляр ярийир, нясилляр эялир.
Eh, sяни унутмаг чятиндир, чятин
Сябирли, хейрихащ илк мцяллимям.

Даьларын башыны думан-чян алды,
Баьчалар солухду, эцлляр саралды.
Ящмядин баьрыны ган-гада алды,
Йашайа билмяди юмрцнц сянсиз.

**Rəfiqə ƏSGƏROVA,**
*Laçın rayon Ağanus kənd*
*tam orta məktəbinin müəllimi*



**NƏSR**

**Fəxri UĞURLU**



## DƏRVİŞ
***(hekayə)***

Uzunayaq, uzundimdik ağ quş yenə payız şumunun ortasında, boz-qara buludun altında qonduğu yerə qonmuşdu. Yenə gözü göydəki boşluqla yerdəki boşluğun arasında get-gəldəydi. Qatarından azıb qalana, yol tanımayana, ya da heç yolu olmayana oxşayırdı. Çiskində tozu da, hay-küyü də yatan kəndin qırağında, barı köçmüş çöllərdə özünə bir bələdçi, yol yoldaşı, ya da sığınmağa yer axtarırdı.

Həyəti dolanıb qapıdan çıxmağa dərvişin hövsələsi çatmadı, quşun gəldiyini görən kimi təndirin böyrünə qoyduğu gödək əl ağacını çalıb götürüb çəpərdən aşdı, yolu keçib arxı adladı, ağacı kürəyinin dalında gizlədə-gizlədə, ayağını qorxuda-qorxuda islanmış şumun içiylə ağ quşa sarı yeridi. Ovuna beş-altı addım qala-qalmaya ovçu ağacını gizlindən çıxarıb quşu nişan aldı. Ağac uzundimdik ağ quşun uzun ayaqlarının bir qarışlığına düşüb qaldı. Quş dərvişə üstdən-aşağı qınaqla baxdı; bu balaca oğlandan qaçmaq istəmirdisə də, onun yaraqlı-çomaqlı üstünə gəlməyi ağ quşun könlünü qırmışdı, dimdiyini lələyinə çəkib eləcə ağır-ağır, arxayın-arxayın, saymazyana uçub getdi, havalanıb çiskinin-buludun içində itdi.

Nə ətinə, nə tükünə, nə lələyinə gözü düşmüşdü; dərviş o quşu minib uçmaq istəyirdi. Uçub uzağa getməyəcəkdi, yox, eləcə bu kəndin üstündə, çəpərlərdən, bacalardan, ağaclardan yuxarı hərlənib-fırlanıb hamıya göydən baxacaqdı, istədiyi qapıya, istədiyi evin damına, istədiyi ağacın budağına qonacaqdı, hər axşam anasının yanına düşüb bulağa gedən qonşu qızı buludların arasından, bağın qalınlığından, ya bir quş yuvasından səhər də, günorta da güdüm-güdüm güdəcəkdi…

Dərviş bundan irəli də uçmağa çalışmışdı: qoluna-qıçına çoxlu quş lələyi bağlayıb özünü ağacdan atmışdı, qollu-qıçlı-lələkli yerə dəyib əzilmişdi; küləkli gündə tayanın üstünə çıxıb quş kimi qanad çalmışdı, bir də tayanın dibində özünə gəlmişdi. Yıxılsa da, əzilsə də, diləyindən küsməmişdi, indi də bu uzundimdik quşa quşu qonmuşdu. Quş da əldən belə getdi.

Səhər-səhər nənəsi əyin-başını təzələyib qapıdan çölə ötürmüşdü. İndi üst-başında, ayaqlarında özü ağırlıqda palçıqla qayıdırdı. Doqqazdan içəri girən kimi nənəsiylə üz-üzə gəldi. Nənə də belə yerdə nə deyər:

– Qancığın küçüyü, ta bezdim sənin altını kürüməkdən! Qarnı yanmış anan gələn kimi verəcəm səni qoltuğuna, aparsın…

Dərviş şəhərdə darıxırdı. Buranın havası dərman qoxuyurdu, ağacları zəhərli bar verirdi, gilli torpağı da azarlı günəşi kimi xəstə-xəstə saralırdı, asfaltının boyağı adamının üzünə, soyuğu sözünə çıxmışdı. Qara-qara buludları türmə qapısına oxşayırdı, hikkəsindən ağacların yaxasını cıran, yaş paltarı sərgidən alıb aparan zəhərli küləyi quşu vurub göydən salır, zir-zibili göylərə sovururdu.

Dərviş qonşunun qara qızıyla həyətdə evcik qururdu. Qurduğunu kənddəki evlərinə oxşatmaq istəyirdi. Qışdan birtəhər çıxsa da, yaz gələndən dura bilmirdi, elə hey yuxu görür, ayılanda burnuna kəndin iyi dəyirdi; sonra şəhərin soyuq, solğun qoxuları beyninə axıb dolub özgə havaları başından çıxarırdı. İndi bu gilli torpağın üstündə özünə çəpərli-darvazalı balaca bir kənd evi qurmaqdan ötrü əlləşirdi. Bu ev o havanı da gətirəcəkdi. Bu evin çəpər qonşusu, o qonşunun da bir sarıtel qızı olacaqdı, o qız hər axşam günbatan çağı anasına qoşulub suya gedəcəkdi. Bu evin bir gözü də uzandıqca uzanan, ortasında boynuburuq bir söyüd ağacı göyərən çöllüyə baxacaqdı, o çölə bir ağ quş qonacaqdı…

Dərviş bu qıza o qızdan danışırdı, ancaq o qızın üzünü yada salmaqdan yaddan çıxarmışdı, eləcə adı, bir də telinin sarısı yada düşürdü. Birdən-birə o sarı tel könlündə yeddi səsin yeddisiylə də nə təhər dilləndisə, dərviş əlini işdən çəkib qara qıza dedi:

– İstəyirsən səni kəndimizə aparım.

– İstəyirəm, ancaq yolpulunu hardan tapacağıq?

– Pulsuz gedərik. Qəsəbənin yanından keçən dəmiryolu görmüsən?.. Bax, o yola düşsək, düz gedib bizim kəndə çıxarıq. Qorxma, mən yolu tanıyıram.

Əl-ələ tutub getdilər. Dəmiryol boyunca sarı çiçəklər bitmişdi, o çiçəklərin hər ləçəyindən yaz günəşinin şirəsi damırdı. Çiçək yığa-yığa, deyib gülə-gülə şəhərdən, darıxmaqdan qaçırdılar. Ötüb keçən qatara əl qaldırmırdılar, dərviş deyirdi qaça-qaça lap tez çatarıq…

Atalar-analar duyuq düşüb qonşuları haya çağırdılar, qonşular da yubanmayıb polisi ayağa qaldırdılar. Polis bəndi-bərəni göz altına aldı. Gün batabatda itkinləri şəhərdən çıxan sonuncu dəmiryol stansiyasının yaxınlığından tapıb evlərinə qaytardılar. Ata-anası sevindiyindən dərvişi danlamadı. Bundan sonra qara qızı bir də onun yanına buraxmadılar.

Dərvişi məktəbə qoymuşdular. Demişdilər yaxşı oxusan, yayda kəndə gedəcəksən, ona görə də bir dərsin, bir tapşırığın üstündən adlamırdı, hamıdan yaxşı oxuyurdu. Müəllimlər onu barmaqla göstərirdilər, pis oxuyan

uşaqlar böyründə yaltaq-yaltaq hərlənirdilər, qızlar başına dolanırdılar. Öz yerini dəyişməzdi, qızların gözəlini yanında oturdardı, bir gözəldən küsəndə onu yanından durğuzub ayrısını çağırardı. Onun yanında oturan qızı oğlanlar incitməzdi, onun yanında oturmayan qız özünü gözəl saya bilməzdi.

Dərviş yenə darıxırdı. Dərs öyrənmək ürəyincə deyildisə də, getdikcə daha boynuna düşən birinciliyi əldən verməmək üçün gecə-gündüz oxuyurdu. Dərs arası dəhlizdəki iri pəncərənin qabağında durub məktəbin bağçasındakı adsız, barsız ağaclara, bir də acı-acı qoxuyan o ağacların dibində qurdalanan quşlara baxardı. Burada adamı göyə çağıran bir quş da tapılmazdı, hara baxsan, küllükdə eşələnən süləngi qarğadan, sırtıq sərçədən özgə bir qanadlı görməzdin; bunların da əlacı olsaydı, caynağını bir an yerdən üzməzdi.

Uşaqlar çox uzaq baxdığını görüb dərvişin başına yığılmışdılar, o baxdığı pəncərədən o baxdığı yerə ha baxırdılarsa da, dərviş gördüyünü görə bilmirdilər. Dərviş onlara boyu boyundan uca olan iri ağ quşdan, o quşu minib kəndin üstündə uçmağından danışırdı. Kimsə onun uçduğuna inanmaq istəmədi. Dərviş mərc gələsi oldu:

– İnanmırsız, gəlin dərsdən çıxan kimi düşək yola, gedək bizim kəndə. Mən orda uçmağı sizə göstərərəm.

Danışdılar, kişi kimi sözləşdilər. İşdən qızlar da duyuq düşdülər. Dərvişin yaxasından asılıb yalvardılar:

– Siz də gəlin, – dərviş dedi, – mən hamını apara bilərəm, bizim evdə hamınıza yer tapılar.

Dərviş yalan demirdi, o görəndə quşun boyu doğrudan da onun boyundan ucaydı, ancaq o quş indiyə qalmazdı, qalsaydı da, indi beli dərvişin qurşağına da çatmazdı. Uçmağı da uydurmurdu; xəyalında o quşun qanadından yerə min yol baxmışdı, ona görə haçansa uçduğuna özü də inanırdı.

Dərsdən çıxan kimi birbaşa yola düzəldilər. Danışığa görə, evə dönməməliydilər, ancaq qızlar danışığı pozdular, evə dəyməmiş gedə bilməyəcəklərini dedilər. Qızları evlərinə dağıdıb tez dönməyi tapşırdılar, günortayacan gözləsələr də, qızlardan qayıdan olmadı. Belə ağır səfərin qız işi olmadığına özlərini inandırıb yola düşdülər. Gün günortadan axşama sarı əyiləndə uşaqlardan biri acdı, pendir-çörək götürmək adıyla evə qaçdı. Onu gözləyə-gözləyə, dönüb geri baxa-baxa getdilər. Az sonra aclıq-susuzluq o birilərə də kar elədi, beləcə tək-tək pendir-çörək dalınca gedib qayıtmadılar. Birinin yadına bazarlıq eləməli olduğu düşdü; o birinin anası evdə yataq xəstəsiymiş; bir ayrısı da axşam atasıyla toya gedəsiydi. Gün batanda şəhərin qurtaracağındakı təpənin başına dərvişdən başqa bircə nəfər çıxmışdı, o da üşüdü, qalın geyinməkdən ötrü evə gedəsi oldu.

Dərviş təpənin dikində oturub gözlədi. Gedənin gəlməyəcəyini bilə-bilə axşamın toranında şəhərdən çıxan yollara baxdıqca baxdı. Sonra qaranlıq düşdü, şəhər özü boyda bir işıq dənizinə döndü. Dərviş şalvarının dalını çırpıb özünü bu dənizə atdı.

Dərviş məktəbi bitirib, yenicə təkər üstə qoyulmuş qırmızı avtobusla kəndə gedirdi. Gözü əlindəki kitaba baxırdısa da, oxuduğu yadından yan ötürdü. Səhərdən kəndin döngəsində, torpaq yolun ana yola calandığı yerdə durub yol gözləyirdi, özünü qarşılamağa çıxmışdı. Yanında oturan qırmızı donlu, dodağı qırmızı boyalı qız gözünün ucuyla dərvişin əlindəki kitaba baxırdı, deyəsən, araya körpü salmaq istəyirdi. Handan-hana kitabı alıb baxdı, bir az kitabdan, sonra özündən danışdı: tələbəymiş, öyrəndiyini öyrənib doğulduğu kəndə qayıdacaqmış, orda işə düzəlib, ərə gedib, doğub-törəyib sonra da öləcəkmiş. Onun bu dünyada görəcəyi işlər bəri başdan bəlliydi.

Sonra qız dərvişdən soruşdu:

– İndi də sən özündən danış. Kimsən, nəçisən?

– Məktəbi yenicə bitirmişəm.

– Aha, deməli, yol ayrıcındasan, bütün yollar sənə öz yolun kimi görünür. Bir azdan ya sən yolu seçəcəksən, ya da yol səni…

– …

– Yoxsa öz yolunu seçmisən artıq? Gələcəkdə nə olmaq istəyirsən?

– Allah olmaq istəyirəm.

Qız diksindi, dodağını büzüb qaşını qaldırdı:

– Allah olub özünü kimə tanıtmaq istəyirsən? Yoxsa adamlara üstdən-aşağı baxmaqdı qəsdin?

– Yox, eləcə hamını, hər şeyi bir baxışla, bir yerdə görmək istəyirəm… Bir də bir ağ quş var, o quşu tutmaq istəyirəm.

Qız dərvişin üzünə getdikcə gediləsi, ünvanını dəyişəsi bir yol kimi baxdı. Avtobus kəndin döngəsində dayandı. Dərviş torpaq yola adlayanda səsə geri boylandı: qırmızı donlu qız hayla-küylə yerindən tərpənən qırmızı avtobusun pəncərəsindən ona əl eləyirdi:

– Məni unutma, – deyirdi, – eşidirsənmi, bax, unutma ha!..

Dərviş durduğu yerdə durub avtobus gözdən itənəcən qıza əl elədi:

– Qorxma, unutmaram, – dedi…

Evlər yerə yatmışdı, ağaclar, dirəklər gödəlmişdi, qapılar alçalmışdı. Nənəsi yumaq kimi yığılıb bapbalaca bir qarıya dönmüşdü. Cırıldayan taxta doqqazların yerində dəmir darvazalar nərildəyirdi. Tikanlı çəpərlərin yerində daş barılar qaldırmışdılar. Qabaq pambıq əkilən çöldə indi taxıl əkmişdilər.

Bulağa gedən yol durduğu kimi dururdu. Bulaq başında əkilən körpə çinar cavanca bir ağac olmuşdu. Qonşunun qızı daha suya anasıyla yox, tək

gedirdi. Saçının sarısı, gözünün acısı, dilinin kəsəri bir az da çoxalmışdı. Baxmaya-baxmaya görürdü, qulaq asmaya-asmaya eşidirdi, kəsməyə-kəsməyə yaralayırdı. Könlündə-gözündə mələklər, yerişində-duruşunda təbiət hər dildə danışırdı. Tozlu yola düşən izlərində kəndin oğlanları yuva qurmuşdular. Həm canında, həm də böyür-başında iki dünya kəllə-kəlləyə gəlmişdi.

Qız bütün oğlanları yolundan qıraq elədi. Bircə dərvişə dəymədi, onun hər gün pusquda durub yoluna çıxmağına, gəlişinə-gedişinə baxmağına cırnamadı, dərvişin dilə gəlib üzündən örtüyü götürəcəyi günü gözlədi. Ancaq dərviş danışmağa ehtiyac da duymurdu, qonşu qızın gözündən baxan mələklə sözsüz də dil tapmışdı. Dərviş kefinə korluq vermirdi, di gəl, qız diz qatlayıb oturammırdı, iki dünya arasında var-gəl eləməkdən əsir-yesir olmuşdu, başında kəllə-kəlləyə gələn iki qoçun zərbindən başını itirmişdi. Sonda dözəmməyib özü dilləndi, dərvişin gözünün içinə dik-dik, acıqlı-acıqlı baxıb:

– Nə istəyirsən? – dedi.

Dərviş ayıldı, ayılan kimi özünü itirib dolaşdı, siftə-siftə nəsə uydurub, istədiyini danmaq istədi, ancaq yalan danışmaq ona çətin gəldiyindən düzünü deyəsi oldu:

– İstəyirəm sən dünya durduqca beləcə bulaq üstə gedib-gələsən, mən də dünya durduqca beləcə sənə baxım. İstəyirəm hər döngəni burulanda qarşıma sən çıxasan, hansı qapını döysəm, o qapını üzümə sən açasan.

Sözlər qızın könlünə nuş oldusa da, qızlığının pəncərəsi daş dəymiş kimi çilikləndi, çiliklənib dərvişin əlini-ayağını doğradı.

– Məni ələ salırsan? – qız dedi. – Bir də səni bu yollarda görməyim!..

Qonşuda iki toy çalındı. Qonşunun sarıtel qızını bir ayrı qonşunun qapısına köçürdülər. El hamılıqla toy evinə axışdı, gen qapı-bacada uşaqlar böyüklərin ayağına dolaşdı. Qazanların buğu ocaqların tüstüsünə, kefli başların dumanı gecədən ağaclara ilişib qalmış seyrək dumana qarışdı.

Dərviş də eldən qalmadı, təzə köynəyinin üstündən təzə pencəyini geyib ayaqqabısını parıldayana qədər sürtdü, tay-tuşuna qoşulub oğlan evinin tünlüyünə qarışdı. Hamıdan uca səslə gözaydınlığı verdi, hamıdan çox deyib-gülüb hamıdan çox yeyib-içdi, şıdırğı hava çaldırıb əldən düşənəcən meydan suladı. Gəlinlər onun oynamağına əl çaldıqca baxışıb gözləşdilər, «bunu oynadan oynadır» dedilər.

Kefli başla toya nəmər salmağı da unutdu, ağlını araq şüşəsinin dibində qoyub ayağının dalına düşdü, oğlan evindən birtəhər uzaqlaşıb ayağının yaddaşıyla yolu tapdı: ayağı onu qız evinə aparırdı. Yolun sağına-soluna keçə-keçə ayağını sürüyüb yaxındakı evlərdən birinə salmaq istədisə də, bacarmadı.

Döngəni burulanda gəlin aparan karvanla qabaqlaşdı. İçi bəzənmiş toy adamıyla dolu bəzəkli miniklər dal-dala düzülüb üstünə gəlirdi. Uşaqlar maşınların yanınca qaça-qaça çığırışırdılar.

Dərviş indicə çiyin vurduğu çəpərdən bir paya çəkib yolun ortasında durdu, gəlin arabasının qabağını kəsdi. Karvan dayandı. Miniklər susdu. Uşaqların hay-küyü yatdı.

– Bu boyda kişi də maşın qabağı kəsər? – gəlin aparanlardan kiminsə səsi gəldi.

Sonra gəlin arabasını sürən oğlanın yanında oturmuş ağsaqqal başını pəncərədən çıxarıb:

– Şərtini de görək, nə istəyirsən, – soruşdu, – puldan, maldan, nəmərdən...

– Şərtim belədi, – gəlin də eşitsin deyə dərviş arabaya lap yaxınlaşdı, – gəlin maşından düşüb mənnən vağzalı oynamalıdı. Yoxsa yoldan çəkilən deyiləm.

Cavan oğlanla ağsaqqal bir-birinə baxıb qapıları açdılar. Dalınca o biri miniklərdən də bığıburma oğlanlar töküluşdü.

Dərvişi möhkəm döydülər, ağzının-burnunun qanını bir-birinə qatdılar, üzündə-gözündə sağ yer qoymadılar. Özünə gələndə nənəsini başının üstündə gördü. Bir sərçəlik gücü qalmayan qarı dizinə döyüb üzünü cırırdı:

– Neynirdin axı o sarı murğuzu, ay evi yıxılmışın oğlu, – deyirdi, – toyu qara gəlsin bunların, koması başına uçsun balama əl qaldıranın…

Dərviş qisas almağın ən ağrısız yolunu tapmaqdan ötrü xəyalında min bir fənd işlədirdi. Onu döyənləri heç cür bağışlaya bilmirdi – bağışlamaq üçün gərək onlardan güclü olaydı. İstəyirdi hamıdan güclü olduğuna heç kimə xətər vurmadan adamları inandırsın; istəyirdi hamının işi ondan keçsin, ancaq heç kim qapısından boynuburuq qayıtmasın. Bütün günü şəhəri veyil-veyil dolaşıb öz-özünə fərman verir, divan-tərəzi qurur, hamıya barmaq silkələyib hər kəsi öz yerində oturdurdu. Qıcanmaqdan dişləri laxlayırdı, divarlara vurmaqdan yumruqları döyənək bağlamışdı. Acığı tükənəndə içi bomboş boşalırdı, heyi-hərdəmi qalmırdı; ona görə acığını tükənməyə qoymurdu, qəzəbinin kürəsinə bir ucdan odun atırdı. Bütün günü asdığını asırdı, kəsdiyini kəsirdi, axşamı da bir meyxana küncündə ağır iş günündən sonra başını dincə qoyurdu.

Nəvəsindən uzaqda nənəsi də balasına bir qızı qıymayanlardan öc almağa çalışırdı. Şalını çiyninə atıb kəndi ev-ev gəzirdi, gündə bir qapıya elçi gedirdi. Qonum-qonşu da bir-birinin küyünə gedib bir-birinin bəhsinə qarını əliboş qaytarırdılar, «sənin nəvən ipləmədi, dəliyə heç köpəkoğlu qız

verməz» deyirdilər. Qarı getdiyi qapıda özünü tox tutsa da, öz evinə sınıq-sunuq, əzik-üzük qayıdırdı.

Dərviş bu ağır xəbəri meyxanada eşitdi. Qabağında yarımçıq araq şüşəsi, bir kasa dovğa gözünü masanın ağ örtüyünə dikib qaldı. Sonra qələm götürüb, əl silmək üçün qoyulan kağızın üstündə nənəsinə məktub yazdı: «Məndən ötrü qapılara düşmə, onsuz da evlənən deyiləm». Ünvan: kəndə, nənəmə.

Meyxanadan çıxanda kağızı cırıb, yanından tələsik ötən küləyin ətəyinə atdı. Yubanıb-yubanıb komendant saatına düşmüşdü. Əsgərlər onu saxlayıb sənəd istədilər. Dərviş küləyə verdiyi kağız qırıqlarını göstərib:

– Odey mənim sənədlərim, – dedi.

Dərvişi tutub komendaturaya apardılar – yeri zibillədiyinə, rejimə tabe olmadığına, bir də dövlət adamıyla məzələndiyinə görə. Səhərəcən onu soyuq kamerada saxladılar. Dərvişin qayğısı artmışdı: indən belə onu bura gətirən əsgərlərdən, onların böyüklərindən də öc almağın yollarını axtarmalı olacaqdı.

Elə bu yerdə, o soyuq kamerada dərvişin beyni işıqlandı: o, gecələr kimsəsiz küçələrdə qorxu-ürküsüz, qoruq-qaytaqsız gəzib-dolanmaq üçün bu şəhərin komendantı olmalıydı…

Dərviş iki hərbi məktəb bitirdi, rütbədən-rütbəyə, vəzifədən-vəzifəyə adladı, o soyuq kamerada cızdığı yolla bir gün mənzilə yetişdi. Şəhərdə istər gecə, istər gündüz onun üzünə bağlı bir yol, bir qapı qalmadı. Ancaq daha gecə gəzintisinə qabaqkı həvəsi tükənmişdi, indi gecə ondan ötrü yalnız iş vaxtıydı. Nənəsi çoxdan dünyasını dəyişmişdi; qulluğunda min-min toplu-tüfəngli əsgər duran nəvəsinin nə boyda güc yiyəsi olduğunu görmək ona qismət deyilmiş. Ancaq o gecə o meyxanada nənəsinə yazdığı məktubda verdiyi sözün üstündə dərviş bərk dayanmışdı: keçib-gedən illərin heç bir ayında-günündə-saatında evlənməyə, oğul-uşaq becərməyə macalı, ya istəyi olmamışdı. Ölkə onun ev-eşiyi, ordu da balasıydı.

Dərvişin adı, sanı, sorağı bir şəhərə, bir mahala sığmırdı, küçə-küçə, qapı-qapı, ev-ev gəzirdi; ancaq ad-san dərvişin vecinə də deyildi, o bütün bu yolları qabaqkıtək yaşamağa, çöldə quş qovalamağa, sudan gələn o qıza dünya durduqca baxmağa ixtiyar almaqdan ötrü keçdiyini yaxşı bilirdi. Ömrünə bir gün də qalsa, uzundimdik ağ quşun qonduğu yerdə özünə dünya quracaqdı, orda bir qala tikdirib bağçasında ağ-ağ quşlar saxlayacaqdı, o quşlar hara uçsa da, qayıdıb ona sarı gələcəkdi. Ömrünə bir gün də qalsa, yaşı yetmiş, səksən, doxsan da olsa, o sarıtel qızı ərindən ayırıb özünə gəlin gətirəcəkdi…

İndi kənddə də hamı dərvişdən danışırdı. Ona işi düşməyən adam çətin tapılardı. Uşağına iş axtaran, əsgər gedən oğlundan arxayın olmaq istəyən, qohumunu tutulmaqdan qurtarmağa çalışan, xəstəsini yaxşı həkimə pulsuz baxdırmaq istəyən, ev alanda aldanan, alverdə pul batıran hamı dərvişin üstünə qaçırdı. Kənddən gələn hər kəsdən qonşu qızı soruşurdu. Dediklərinə görə, sağ-salamat, kefikök yaşayırdı, özünə ev-ocaq qururdu, qarışqa kimi hər gün dimdiyində balalarına yem daşıyırdı. Hə, özünə oxşayan bir qızı da varmış, hər axşam anasıyla bulaq üstə gedirmiş.

Kənddən gələn hər kəsin işini də düzəldirdi, cibinə pul da qoyurdu. Onu döyənlərdən dərviş, bax, belə qisas alırdı.

Dərviş qulluğunu başa vurub təqaüdə çıxdı. Saxlancını, olan-olmazını götürüb kəndə getdi. Ömrünün dönüş çağında tökdüklərini yığmalı, itirdiklərini tapmalıydı. Hamıdan, hər şeydən qabaq özünü tapmalıydı – seyrəlmiş ağ saçlarının, qırışmış dərisinin, enlənmiş gövdəsinin bərk-bərk büküb gizlətdiyi özünü…

Dərviş o kənddə azdı. O gördüyü yollar çoxdan pozuq-pozuq olmuşdu – o yolların kəsib keçdiyi yerlər həyət-həyət, məhlə-məhlə bölünüb yeni ev quranlara paylanmışdı. Ağ quşun qonduğu çöldə də bir qarış çöl qalmamışdı – orda böyük bir bazar salıb böyründə ondan da böyük geyim-kecim yarmarkası tikmişdilər. Qalan boşluğu da boyağının qoxusu hələ çəkilməmiş yanacaqdoldurma məntəqəsi, cürbəcür miniklərə cürbəcür qulluq göstərən ayrı-ayrı tikililər doldurmuşdu.

Dərviş bazarda quş satanlardan ağ quşu soraqladı, başlarını bulayıb çoxdandı bu yerlərdə o nişanda bir quş görmədiklərini dedilər.

Dərviş gördüyü evlərdən tək-təkinin daşı daş üstə qalmışdı. İndinin evləri ayrı yöndə, ayrı biçimdə tikilirdi, hasarı da bir adam boyunca yox, üç adam boyu qaldırılırdı.

Tanış ağaclardan da sağ qalanı yoxudu. Bircə bulaq başındakı çinar dururdu – qol-qanadlı, gövdəli, kölgəli bir azman ağac olmuşdu. Bulağa gedən cığır da yekə bir dəyirmanın altında qalmışdı. Dəyirmanı böyür-başı, bulağı, çinarı, bağı qarışıq dəmir çəpərə almışdılar – indi daha qız-gəlin bura suya gəlmirdi. İndi bulağın suyu qapılara gəlirdi.

Qonşu qızı ərindən ayırmağa da ehtiyac olmadı – əri ölmüşdü.

Dərviş geri qayıtdı.

Dərviş can verirdi. Xəbər tutan qohum-qardaş, dost-tanış yatağının yanını kəsdirmişdi. Molla başının üstündə yasin oxuyurdu.

Ölüm onu qəfil yaxaladığından son sözünü deməyə macal tapmamışdı. Bayaqdan gözü deyəni sözlə deməyə ha can atırdısa da, dili dönmürdü.

Handan-hana bu dünyada olub-qalan son gücünü toplayıb dodağını dodağına vurdu:

– Məni dəyirmanın həyətindəki çinarın altında… – deyə bildi.

Qohum-qardaş, dost-tanış ürkək-ürkək baxışdı. Mollaya genəşdilər. Molla cinlənib özündən çıxdı:

– Nə danışırsız, siz dindən qıraqsız, kafirsiz, nəsiz?! Ölünün ölü yeri var. Hər kəs bəyəndiyi yerdə özünə qəbir qazdırsa, dünyada dirilərə yer qalmaz ki! Tutalım, mən razılıq verdim, bəs o dəyirmanın, o torpağın yiyəsi adama nə deyər? Mən heç qəbirstanlıqda otlayan qoyunun ətini halal saymıram, indi deyirsiz elin çörək ağacının dibində ölü basdıraq?..

Molla cənazənin qabağına düşüb boş bədənə bələdçilik eləyirdi. Dərvişin xatirəsi üzü yas tükü gətirmiş qəmli kişilərin çiynindəki taxta beşikdə bəxtəvər-bəxtəvər yırğalanırdı. O, ən böyük diləyinə çatmışdı – dünyanın ən ağır qayğısından qurtulmuşdu. İndi onu nənəsinin yanında yenicə qatı açılmış torpağa bükəcəkdilər, özü boyda bir yaranı sarıyıb özü boyda bir ağrıya məlhəm qoyacaqdılar. Daha onu nənəsindən heç nə ayırmayacaqdı, indən belə nənəsiylə tay-tuş, qardaş olacaqdı…

Dərviş gendən durub gedənlərə əl eləyir, gövdəsinə xeyir-dua verirdi:

– Yaxşı yol, qardaş, yaxşı yol! Səni çox incitmişəm, əməyini halal elə, qardaş, halal elə!..

O üzündə gün işaran boz-qara buludun içiylə yanınca bir quş uçurdu:

– Tanıdın məni, – quş deyirdi, – tanıdın?.. Mən də uçmaq istəyirəm, – deyirdi, – məni də apar özünlə, məni də apar…

***Gəncə, 16 fevral 2006***

**MÜNASİBƏT**

## XƏYANƏT, YOXSA QURULMUŞ İMPERİYA OYUNU?

1992-ci ilin may ayı idi. Artıq Şuşanın işğalından bir neçə gün keçirdi. Erməni silahlı qüvvələri Turşsu qəsəbəsinə qədər gəlmişdilər. Bakıdan və başqa bölgələrdən gələn özünümüdafiə batalyonları döyüşlər gedən tərəfə istiqamətlənirdi.

Biz Laçın rayon özünümüdafiə batalyonunun döyüşçüləri ilə rayonumuzu müdafiə etmək istəyirdik. İstər mülki əhali, istərsə də əsgərlər çaşqınlıq içərisində idi. Vahid bir komandanlıq yox idi ki, bu başıpozuq kütləni bir istiqamətə yönəltsin.

Cəbhə xəttindən təzadlı xəbərlər gəlirdi. Bəzən xəbər yayılırdı ki, düşmən geri oturub, Şuşa şəhəri yenidən azad edilmişdir. Bəzən isə ermənilərin bizim rayona yaxınlaşdığı bildirilirdi.

Bizim batalyonda ağır zirehli texnika yox idi. Ancaq digər regionlardan gələn hərbi hissələr tank və "BTR"-lər də gətirirdilər. "Qrad" qurğular gətirənlər də vardı. Biz bu silahları görəndə ürəklənirdik. Bu qədər silah-sursatı və canlı qüvvəsi olan bir dövlətin bir qarış torpağının da düşmənə verilməyəcəyini düşünürdük.

Vəziyyət isə hər keçən gün bir az da pisləşirdi. Cəbhədən yaralılar gətirilir, bizim rayon mərkəzi xəstəxanasına çatdırılırdı. İlk yardım göstərilən yaralılar oradan arxaya yola salınırdı. Cəbhədən geri dönən insanlar döyüşdükləri ordunun erməni ordusu yox, başqa ölkələrdən gəlmiş zəncilər olduğunu, ya da muzdla tutulmuş rus hərbi birləşmələri olduğunu söyləyirdilər. Əlbəttdə, bu xəbərlər mülki əhali, hələ əli silah tutmağı bacarmayan, düşmənlə ağıllı-başlı qarşılaşmamış əsgərlər arasında bir xof, qorxu yaradırdı.

Hərdənbir Ermənistan ərazisindən – Gorus rayonundan bizim rayona, Laçın rayon mərkəzinə və ətraf kəndlərə "Qrad" qurğularından mərmilər atılır, mülki əhali arasında təlafat yaranırdı. Vəziyyət hər keçən saat bir az da pisləşirdi. Artıq xəstəxanada az sayda həkim və tibb işçiləri qalmışdı. Yaralılara yardım göstərilmirdi. Əhali daha ciddi təşvişə düşürdü. Geri çəkilən başıpozuq ordumuz özünü sığortalamaq üçün müxtəlif şayiələr yayırdılar.

Beləliklə, 1992-ci il may ayının 17-si gəldi. Rayon üzərindən erməni vertolyotları Ermənistandan Qarabağa uçuşlar edirdi. Nə üçünsə Azərbaycan ordusunun atıcıları bu vertolyotları vurmurdular.

Bizim batalyonumuzu Suarası və Fərəcan kəndlərinə göndərmişdilər ki, həmin istiqamətlərdən rayon ərazisinə erməni girsə qarşısını alaq. May ayının 17-də kəndin üstündən bir vertolyot keçdi. Təpələrin arxasında gözdən itdi. Bir az keçmişdi ki, kimsə yuxarıda kolluqların və qayalıqların arasında ermənilərin göründüyünü dedi. Hamı təşvişə düşdü. Erməni silahlı qüvvələrinin sayca çoxluq təşkil etdiyinə görə biz geri çəkilməli olduq, Qubadlı ərazisinə keçdik. Artıq axşam idi. Orada gecələyib may ayının 18-də "Tikanlı Zəmi" deyilən yerə gəldik. Oradan rayon mərkəzi açıq görünürdü. Ermənilər rayon mərkəzi küçəsinin hər iki tərəfində yerləşən evləri və mağazaları yandırırdılar. Onlara isə heç bir müqavimət göstərilmirdi. Biz məyusluqla bu vəziyyəti müşahidə edib Azərbaycanın içərilərinə çəkilirdik.

Kaş həmin dövrdə Azərbaycan dövlətinin rəhbəri elə siyasətçi olaydı ki, xalqı və ordunu bir yumruq kimi birləşdirib torpaqların işğal edilməsinə imkan verməyəydi. Şayiələr yayıb xalqı qorxuya salan, özü də bilmədən, ya da bilərəkdən ermənilərə xidmət edənləri cəzalandıraydı. Onda bu müsibətlər başımıza gəlməzdi.

**Araz ELSEVƏR**

## LAÇIN OĞLUYAM

Məndən haralısan soruşan insan,
O illər dustağı Laçın oğluyam.
Bu doğma yurdumuz Azərbaycanın,
Üçrəngli bayrağı Laçın oğluyam.

Hər qarış torpağı lələ bərabər,
Hər qayası keçmişimdən bir xəbər.
Özünü sevdiyim bir ana qədər,
Tərlanlar oylağı Laçın oğluyam.

Bütün Zəngəzurun, ulu Göyçənin,
Borçalı elinin, həm də Dərbəndin,
Dağlıq Qarabağın, gözəl Təbrizin
Üzünün qaymağı Laçın oğluyam.

Qələm kədərlənir, ağlayır varaq,
İndi sahib olub dünənki qonaq.
Dediyim sözdəki həqiqətə bax,
O ellər yaylağı Laçın oğluyam.

Mən Arazam, doğma yurdum talanır,
Ürəyim alova, oda qalanır.
Qaysaqlamır, hələ yaram sulanır,
Pozulmuş novrağı Laçın oğluyam.

## ÇAĞIRIR MƏNİ

Yenə yada düşüb o doğma yurdum,
Qartallar yuvası çağırır məni.
Qəlbimdə dolanır hər cığır, hər iz,
Hər daşı, qayası çağırır məni.

Könlümdə bir yığın həsrət, nisgil var,
Dərdliyəm, gen dünya olub mənə dar.
Xəyalım çin olsun, Tanrı, nə olar,
Oymaqlar, obalar çağırır məni.

Köçəri quşlar da qayıdıb gəlib,
Bülbülün nəğməsi göyə yüksəlib.
Öz yaşıl libasın təbiət geyib,
O yaşıl libası çağırır məni.

Sel seli hey qovur dərə boyunca,
Yaman kövrəlirəm bunu duyunca.
Ətrafa gurultu, səs-küy salınca,
Sellərin sədası çağırır məni.

Talada çiyələk yetişib dəymiş,
Çiçəklər ağacın budağın əymiş.
Arazam, qismətim, yazım beləymiş,
Anamın anası çağırır məni.

**DOST SÖZÜ**

## МЯНИМ «БАЩАДЦР МЦЯЛЛИМ» АДЛЫ БИР ДОСТУМ ВАРДЫ



Биз таныш оланда мян Бакыдайдым, о, Лачында йашайырды. Биз дост оланда ися Бакыда гоншу идик. Танышлыьымыз елми-методик дискуссийалардан башламышды. О, профессор Аьаммяд Абдуллайевин, мян профессор Язиз Яфяндизадянин диссертанты идим. Тез-тез эюрцшяр, йол эяляр, сющбят едяр, ъцмляляр тящлили цзяриндя баш сындырар, црякляримиздя бир йахынлашма, говушма щисс едярдик.…

Эцълц мцяллимлийи, ъидди алимлийи варды. Щям дя юз сюзц, юз мянтиги олан адам иди. Щеч кясдян чякинмяйян, дцшцндцйцнц сюйляйян, инсанлары гиймятляндирян, дяйярляндирян, севян, гардашлыг эюстярмяйи баъаран адам иди. Гоншу олана кими артыг бир-биримизя мяняви теллярля баьланмышдыг. Шюбямизя эяляндя elə гаршылайардым ки, юзцнц бизим институтда црякли щисс етсин. Йолдашларла таныш етмишдим, елми мцзакирялярин тонгалына юз чырпыларыны атыр, мяслисин аловланмасында фяаллыг эюстярирди. Елми мцталияси варды, мцяллимлик сяриштяси варды, мющкям ирадяси варды.

Бакыйа эяляня гядяр Лачында müəllim ишлямишди. Бащалы машыны, эюзял евляри вармыш. Бунлар мяним гулаьыма эялиб чатанлар иди. Йерлиляри демишдиляр. Онлар эилейляниб дейирдиляр: «Ня варды е Бакыда? Бурада щачан ев алаъаг, карйера гураъаг? Району нийя атды?» вя с.

Бащадцр мцяллимля бу щагда сющбятимиз олмайыб. Мян ондан бу барядя щеч ня сорушмадым, о да мяним хасиййятими билиб heç nə демяди. Ону билирдим ки, Бакыйа елмя, алимляря йахын олмаг цчцн эялиб.

Мяним щяйатымда чохлу достларым олуб вя инди дя вар; буну демямяк намярдлик олар. Янвяр Аббасов, Акиф Аббасов, Янвяр Иманов, Акиф Иманов, Айдын Ширинов, Рамиз Ялийев, Фяращим Садыгов,

Щашым Гафаров, Октай Аббасов, Сейидяли Мяммядоv (егоистляри чыхмышам о сырадан)….

Онларын щяр бири иля Бащадıр мцяллими таныш етмишдим. Бащадıр мцяллими севирдиляр. Бу достларым цчцн бир цмуми ъящят вар: достлугда сядагятли олмаг!

70 иллик щяйатымда газандыьым мяняви капиталым бунлар олуб – инсан капиталы. Щеч кяс мяним гядяр дювлятли ола билмяз. Мян буна анд ичирям! Дювлятли олдуьуму эизлятмирям вя бойнума алырам! Щяйатда бу инсанлардан цряк оду эютцрмцшям, исинмишям, севинмишям, одланмышам, аловланмышам!

Бащадıр мцяллим щагда дцшцндцклярим, ялбяття, чохдур. Биз дост идик – юзц дя цряк досту. Щяйатда достлар ичярисиндя мяня эюря севиниянлярдян ян биринъиси рящmятлик Бащадıр мцяллими эюрмцшям.

…Габагъыл мцяллим, эцълц методистлийи иля сечилян бу инсанын районда ишлядийи мцддятдя дил-ядябиййат мцяллимляринин ихтисас журналында нечя-нечя мягаляляри чыхмышды. Профессор Аьаммяд Абдуллайев (Аллащ щяр икисиня рящмят елясин!) Бащадıр мцяллими диссертантурайа гябул етмишди. Бащадıр мцяллим намизядлик диссертасийасыны вахтында йазыб баша чатдырмышды. О, мцхтялиф сябябляр цзцндян мцдафия еляйя билмямишди. Мян билян, Лачындан Бакыйа кючмяйинин мягсяди də бу иди ки, мцдафия етсин, алимлийини давам етдирсин. Лакин щяйат еля эятирди ки, Аьаммяд мцяллим рящмятя эетди вя она йахындан кюмяклик еляйянляр тапылмады.… 350 сящифялик щямин диссертасийаны мян бу эцн дя елми-методик ъящятдян чох санбаллы фикир топлусу щесаб едирям.

Аьаммяд мцяллим елмдя дя, щяйатда да алим-шяхсиййят кредосу иля йашайанлардан иди. Эюзц тох, кюнлц тох. Язиз Яфяндизадя кими, Ябдцл Ялизадя кими, Мещди Мещдизадя кими, Якбяр Байрамов кими, Абдулла Мещрабов кими. Аллащ рущуну шад елясин Аьаммяд мцяллимин ки, Бащадıр мцяллимин методик ахтарышларыны вя тапынтыларыны йцксяк гиймятляндирярди.

Бащадıр мцяллимин методист тяфяккцрц юз яксини ашаьыдакы мювзуларда, йаздыьы мягалялярдя тапмышдыр:

1. Фонетик тящлилин нитг инкишафына тясири
2. Рабитяли нитг вярдишляринин инкишаф етдирилмяси

3. Ъцмлянин гурулушуна эюря тящлили
4. Синтактик тящлил заманы гаршыйа чыхан чятинликляр вя онларын арадан галдырылмасы йоллары
5. Тяйини сюз бирляшмяляринин тядриси мясяляляри
6. Шифащи нитгин йазы вярдишляринин формалашмасына тясири вя с.

«Азярбайъан дили вя ядябиййат тядриси» елми-методик журналы о заманлар, йяни ötən əsrin 50-60-ъы илляріндян та 70-ъи иллярин яввялляриня кими professor Аьаммяд Абдуллайев тяряфиндян редактя олунурду вя Бащадıр мцяллим дя щямин журналын даими ямякдашларындан иди.

Щямин иллярдя дил-ядябиййатын тядриси мясяляляриндя башлыъа диггят нитг инкишафы проблеминя йюнялдилирди. Бу истигамяти мцяййян едян бир чох амилляр варды: яввяла, республика мцяллимляриня вя педагожи елмя академик Мещди Мещдизадя рящбярлик едирди. Мещди Мещдизадя 30 ил маариф назири ишлямишdі вя ССРИ Редагожи Елмляр Академийасынын щягиги цзвц иди. Елми санбалы олан нцфуз сащиби иди. Бащадıр мцяллими дя чох йахшы таныйырды. Нитг инкишафы проблемлярини эениш арашдырмаг щяр кясин баш чыхардыьы сащялярдян дейил. Еля индинин юзцндя дя мцяллимляримиз шаэирдлярин нитгини инкишаф етдирмяйин структур-мязмун хяритясини йахшы билмирляр. Лакин Бащадıр мцяллимин мягаляляриндя, щабеля диссертасийасында сясдян, сюздян, ъцмлядян мятня доьру шифащи вя йазылы гурулан инкишаф хятти нитг инкишафы методолоэийасы сайылыр. Бащадıр мцяллимин о заман мяшьул олдуьу елми-методик сащя бу эцн йеня актуалдыр. Бу сащяни мян давам етдирирям. Дост, йолдаш, сирдаш, гардашлыьымызда бу амилин дя ролу варды. Биз нитг инкишафы иля тяфяккцр инкишафыны вахтында дярк етмишдик. Тяяссцфляр олсун ки, индинин юзцндя дя elə мцяллимляр вя алимляр вар ки, Бащадıр мцяллимин орфоепийайа аид биликляриндян вя йаздыгларындан ашаьы сявиййя нцмайиш етдирирляр.

О заманлар шифащи вя йазылы иншалар нитг инкишафында зирвя сайылырды. Бащадıр мцяллимин бу барядя эюзял фикирляри варды. Бунлардан бири ъцмляни эенишляндириб мятня чевирмякля баьлы методика иди. Диэяри айры-айры анлайышлары бир цмумидя интеграсийа етмяк иди. Мясялян, **ана, Вятян, ясэяр, мцдафия, ювлад,**



**боръ** мяфщумларынын шаэирдляря лексик мянасыны яввялъя ачмаьы, сонра онлары ващид мювзуйа уйьун йахынлашдырмаьы вя нятиъялярля тамамламаьы тапшырмаг бу эцн ня гядяр гиймятли вя ня гядяр актуалдыр. Азярбайъан дили дярсляриндя тест тапшырыглары иля ишлямяк билийя щесабланан стратеэийадыр. Щеч бир саьлам мянтигя ясасланмыр. Она эюря ки, дил тядрисинин апарыъы истигамяти коммуникативликдир, щалбуки, тест тапшырыглары информативлийя хидмят едир. Информативлик шаэирд бейнинин биликлярля йцклянмясидир. Нитг инкишафы башлыъа мягсяд олмалыдыр. Чцнки дил инсанлар арасында цнсиййят васитясидир. Демяли, дилин язяли вязифяси цнсиййятдир. Цнсиййят цчцн сюз, ъцмля, мятн лазымдыр. Демяли, шаэирдлярин нитгини рабитясиз вя рабитяли мятнлярля силащландырмаг М.Я.Сабирин бящри-тявиллярини мянимсямяк кими анлашылмалыдыр. Бурада щямъинс сюзляр, щямъинс бирляшмяляр, щямъинс ъцмлялярин доьурдуьу дярин мяналар вар.

Шаэирд нитгини Азярбайъан, фарс, рус вя с. ядябийатына даир нцмунялярля зянэинляшдирмякля ядяби тяляффцз вя дцзэцн йазы нормаларыны мянимсямяк Бащадuр мцяллимин амалы иди. Бу арзуну, бу амалы мян бир щямфикир, дост олараг инди дя давам етдирирям. Аллащ она гяни-гяни рящмят елясин!

Балаларымыз да бизим достлуьумузу давам етдирирляр. Бир-бирляриня чох мещрибандырлар. Халид, Рафиг, Тофиг, Исэяндяр бизим мцяллимлийимизи давам етдирмясяляр дя, цряклярימизи о бюйцк саф мящяббятля ъошдурмаьы давам етдирирляр. Аллащ Бащадuр мцяллимин балаларына щяйатда уьур газандырсын. Онларын уьурлары мяня вя бизя олан севэи вя сайьыларыны аловландырыр. О аловланан атяш бизим цряклярימиздир.

**Вагиф Тапдыг оьлу Гурбанов,**
*pedaqogika üzrə fəlsəfə doktoru*

**<u>AXTAR BABALARI</u>**

# ƏHMƏDOV ALXAN ƏHMƏD OĞLU

1891-ci ildə Laçın rayonunun İmanlar kəndində doğulub boya-başa çatmışdır. Alxan kişi bütün el-obada sayılıb-seçilən, çox mehriban, ədalətli, üzü nurlu bir kişi kimi tanınmışdır. Alxan kişinin 5 qardaşı – Əsəd, Əmir-xan, Sərxan, Dəli Məmməd, birinin adı bəlli deyil və iki bacısı – Balaxanım, Mina olmuşdur. Alxan kişi 5 qız övladını halal zəhməti ilə böyüdüb ev-eşik sahibi etmişdir. İndi qızları Tümən, Urquya, Sərfinaz və Avşəkər də həyatda yoxdular, haqq dünyasına qovuşublar. Qızı Əhmədova Yetər isə hal-hazırda Ağdam rayonunun Zəngişalı kəndində oğlu Hüseynlə birgə yaşayır.

Alxan kişi 1935-1936-cı illərdə Ağdam rayonunun Zəngişalı kəndinə köçmüş və ömrünün sonunadək burada ömür sürmüşdür. Ağdam rayonunda yaşadığı dövrdə oxumadan, heç bir təhsil almadan baytarlıqla məşğul olmuş, insanların mal-qaralarına təmannasız xidmət göstərmişdir. Onun şəxsi mal-qarası çox olduğundan qapısına oğurluq məqsədi ilə gələnlər də varmış. Bir dəfə həyətə oğru girdiyini hiss edən Alxan kişi oğrudan əvvəl tövləyə girərək gizlənir. Oğru tövləyə girib qoçları seçərkən Alxan kişi ən kök qoçu götürüb oğruya uzadır və deyir: “Ala keçəl, ala keçəl”. Əl atıb qoçu ondan alan oğru elə başa düşür ki, Alxan kişi onunla gələn oğru yoldaşıdır. Alxan kişi həmin an əl atıb oğrunun xirtdəyindən elə sıxır ki, oğrunun elə yerindəcə ürəyi gedir. Alxan kişi onun ayağına buxov vuraraq evə gətirir, qabağına mis qabda doğrama qoyub deyir: “Alxanın tələsinə düşməmisən hələ. Düşdün gəlməzsən həvəsə”. Bu əhvalat hələ də el arasında danışılır. Kəndin ağsaq-qallarından aldığımız məlumata görə, belə hadisələr dəfələrlə təkrarlanır və oğrular bir daha Alxan kişinin yaşadığı əraziyə ayaq basmırlar.



Alxan kişini sağlığında görənlər onu ucaboy, enlikürək, fiziki cəhətdən çox güclü bir insan kimi xatırlayırlar. Nurani görkəmə malik olsa da yeri gələndə həddindən artıq zəhimli görünərmiş. Təsadüfi deyil ki, heç vaxt qorxu nə olduğunu bilməyən Alxan Əhmədov gənc yaşlarında bir müddət görkəmli Azərbaycan milyonçusu və xeyriyyəçi Musa Nağıyevin mühafizəsində xid-mət göstərmiş, indiki adla desək, onun “cangüdən”lərindən biri olmuşdur.

Alxan kişi 1972-ci ildə dünyasını dəyişmiş və Ağdam rayonunun Zən-gişalı kəndində dəfn edilmişdir.

Ölümündən uzun illər keçməsinə baxmayaraq Alxan kişini nəvələri, nəticələri, kötücələri, onu tanıyanlar və haqqında eşidənlər hər zaman anır, yada salır.

***Təqdim etdi*: Hüseyn ƏHMƏDOV**

**KİTAB RƏFİ**

## "ZƏNGƏZUR TOPONİMLƏRİ"




Azərbaycan Respublikası Milli Məclisinin Toponimiya Komissiyasının üzvü, şair-publisist Musa Urudun bu kitabı Vətənimizin ən qədim və zəngin tarixə malik bölgələrindən biri olan Zəngəzurun yer-yurd adlarının tədqiqinə həsr edilmişdir. Bölgədəki 838 toponimin ətraflı izahı verilən bu kitabı müəllifin elmi-publisistik "Zəngəzur" kitabının ikinci hissəsi də hesab etmək olar. Kitabda müasir eranın əvvəllərindən ta çağdaş günümüzə qədərki mənbələr, sənədlər, elmi ədəbiyyat və xatirələr, habelə yerli sakinlərin məlumatları əsasında Zəngəzurdakı toponimlərin tarixi, etimologiyası, bölgənin mədəni-etnoqrafik mənzərəsi ətraflı tədqiq edilmiş, bu qədim türk torpaqlarında yaşayan insanların həyatı, məişəti və mübarizəsi toponimlərin dili ilə oxuculara çatdırılmışdır. Kitab bölgənin tarixi, toponimiyası, mədəni-etnik xüsusiyyətləri ilə maraqlanan alimlər, tədqiqatçılar, tələbələr, habelə geniş oxucu ictimaiyyəti üçün nəzərdə tutulmuşdur.

**NƏSR**



**Təranə VAHİD**

## *İKİ HEKAYƏ*

## MÜHARİBƏ, NƏNƏM VƏ İTƏN VAXT

***Vaxt nənəmi götürüb apardı, bəs müharibəni kim aparacaq?..***

Yaddaşımı qurdaladım, nənəmin boğçası çıxdı. Boğçadan rəngi qaçmış, dörd qatlanmış bir kağız tapdım. Kağızda kiril əlifbası ilə alt-alta bu sözlər yazılmışdı:

... Qarabağın ölüm tarixləri çoxdur...

... Qarabağ – bir ovuc torpaq da deyil...

... Qarabağ – Vətəndir, dağı-daşı, kolu-kosu, odu-ocağı, eli-obası, pisi-yaxşısı ilə ...

Şuşa-Laçın əldən gedəndə baharın oğlan çağıydı. Bu vaxtlar Qarabağda qan qaynayır. Amma Xocalı qanımızı elə qaraltmışdı ki, o bahar qan qaynamadı.

Boğçadan nənəmin günəşə oxşar gülümsər çöhrəsi boylandı. Deyəsən, darıxmışdı, sağlığında olduğu kimi, "cincili balam"- deyib kefimi açdı.

Yalan olmasın, üstündən bir ömür keçsə də, hələ də "cincilim" sözünün mənasını bilmirəm. Bildiyim odur ki, ota, ya da çiçəyə oxşayan bu söz dünyanın ən yaxşı sözdür.

Nənəmlə hal-əhval tutandan sonra boğçanın qırağında oturdum. İndi sizi də bir xatirəyə qonaq edib nənəmin hekayətini danışacağam.

Nənəm dünyanı görə-görə xeyli kələf sarımışdı. Üç qardaşı İkinci Dünya müharibəsinə gedib geri qayıtmamışdı. Nənəmin sirli bir sandığı vardı. İllər boyu açılmazdı. Açanda qiyamət qopardı. Qardaşlarının şəkillərinə baxanda nənəmin ürəyi gedərdi. Odur ki, sandığı açıb nənəmin ürəyini qanatmağa heç kimin ürəyi gəlməzdi. Nənəm yana-yana "Hitlerin ağzında it yatsın, üç qardaşımı uddu" – deyib gorbagordan qisasını belə çıxardı.

Nənəm qocalsa da, əldən düşməmişdi. Evini-eşiyini ha özündən deyən qız-gəlindən səliqə-sahmanlı saxlayırdı. Ona görə də nənəmgilin evi muzeyə oxşayırdı. Kimsə cürət edib nənəmin nizamını poza bilməzdi. Amma ermənilər nənəmin nizamını pozdular...

... Axşamçağı qaçaqaç düşdü. Nənəm özünü itirmişdi. Başıalovlu qapını açıb içəri keçdi. Mən də kölgə kimi nənəmi izlədim. Nənəm babamın divardan asılmış şəklinin qarşısında dayanıb dodağının altında nə isə mızıldandı. Bilmirəm, dua edirdi, yoxsa babamla halallaşırdı, Allah bilir; bəlkə də babamdan, həmişəki kimi "a kişi, gedim-getməyim?" – deyə, icazə istəyirdi.

Bu yerdə mütləq deməliyəm ki, babam Böyük Vətən Müharibəsindən orden-medalla yox, bir ətək qəlpə ilə qayıtmışdı. Ömrünün sonunacan müharibənin yaraları ondan əl çəkmədi, qəlpələr babamın axırına çıxdı. Şəkildə də narahat görünürdü. Nənəm hələ də babamın şəkli qarşısında nə isə deyirdi. Amma sözünü sonacan deyə bilmədi, mərmi haradasa lap yaxında partlayıb nənəmin "söhbətini" yarımçıq qoydu.

Aləm yenə qarışdı. Nənəm həyətə qaçdı. Kənd çalxalanırdı... Elə bil, adam ölmüşdü. Yox, bu dəfə adam ölməmişdi, bu dəfə kənd ölmüşdü, yerdən götürəni yox idi. Şər qarışdıqca insanların xofundan, təlaşından itlər səs-səsə verib uzun-uzadı ulaşırdı...

Evdən çıxanda nənəm hıqqına-hıqqına çörək təknəsini gətirib düz qapının ağzına qoydu. Dedi ki, heç kim bu çörəyi tapdayıb keçməz. Bu sözləri nənəm dedi. O nənəm ki, 1918-ci ildə ermənilərin bizə tutduğu divanı, qan gölməçəsini, diri-diri yandırılan insanların cəsədini gözləri ilə görmüşdü. Amma bu dar macalda – erməni toplarının mərmiləri altda nənəm yaddaşını itirmişdi. Həm də nənəmə elə gəlirdi ki, Leninin qurduğu oraq-çəkicli şura hökuməti erməniləri adam eləyib, sadəlövh nənəm... Qapı örtüldü. Təknə qapının o üzündə qaldı. Nənəm şəməngül gözləri ilə üzümə baxıb qorxacaq səslə dedi:

– Nənə qurban, bu gün-sabah qayıdacağıq.

Ümidsiz-ümidsiz nənəmin sözünü təsdiqlədim.

Nənəm heç vaxt kəndlərindən kənara çıxmamışdı. Düzdü, babam sağ olanda ona qoşulub pay-piyada qonşu kəndlərin xeyrinə-şərinə gedərdi, amma uzağa getməzdi. Maşın minəndə ürəyi bulanardı. İndi əlacını Allah kəsmişdi. Kəndin ortasında kurzavoy maşının arxa qapısını açıb əvvəlcə qoca-qarıları tələsik maşına yığdılar. Nənəm maşına qalxanda qocalar səs-səsə verib ağı dedilər, qımıldanıb ona da yer elədilər. Nənəm təlaşlı gözləri ilə ətrafa baxırdı. Bilmirəm maşının dərdi onu götürmüşdü, yoxsa qoyub gəldiyi ev-eşiyinin...

Kənd maşına "köçüb" qurtarandan sonra hay-haray kəsildi. Qənimət kişinin kal səsi eşidildi:

- Ədil kişi getmir!

Hamı bir anda diksindi. İki-üç nəfər Ədilgilə tərəf qaçdı. Bir azdan qaçdıqları kimi də geri qaçdılar. Bircə kəlmə dedilər: "Ədil kişi gəlmədi". Başını itirmiş şaşqın adamlar ermənilərin atdığı alazanın işığında Ədil kişini yaddaşlarından itirdilər.

Kənd işıqlandı. Əslində bu qıpqırmızı mərmi qaranlığı yarıb düz kəndin ürəyinə sancıldı. Maşının yerindən tərpənməyi ilə adamların eyni vaxtda səs-səsə verməyi bir oldu.

Kənd sonuncu dəfə xorla oxudu...

Maşın kənddən qaçdıqca maşındakıların ürəyi kəndə tərəf qaçırdı. Get-gedə nənəmin vəziyyəti pisləşirdi. Sən demə, nənəmdən də pis gündə olanlar varmış. Maşın sıldırımlı döngədə nəfəsini sıxıb dönəndə Nənəş arvad dəli kimi havalandı. Oğlunu inişil ermənilər dağda öldürmüşdülər. Yazıq arvad qəfildən balasını qoyub getdiyini anlayıb hamının gözü qarşısında dəli oldu. Maşın vahimədən diksindi. Amma dayana bilmədi, döngəni dönüb dayandı. Hər yan zülmətə bürünmüşdü. Nənəş arvad qışqırırdı, saçını yolurdu, ağzına gələni danışırdı. Alazanlar, toplar, avtomatlar şaqqaşakla atırdı.

Maşındakılar gah kəndi ağlayırdılar, gah Ədili, gah da Nənəşi...

Tərs kimi yağış da başlamışdı. Qaranlıqda nənəm canlı meyitə oxşayırdı. Ürəyi bulanırdı, başı bulanırdı, dünya bulanırdı...

Yağış kimi həzin-həzin ağı deyən arvadlara qoşula bilmədiyindən ürəyi hökm edirdi yerindən çıxsın. Bir ara hörüyümü dartışdırıb qulağıma pıçıldadı:

- Nənə qurban, hələ çox var?

Guya harada olduğumuzu bilirdim.

- Az qalmışıq – dedim.

Nənəm dediyimə inandı. Bircə onu bilirdim ki, arana tərəf gedirik. Get-gedə dağdan enirik, gedə-gedə yazıqlaşırıq, gedə-gedə zülmət qaranlığın içində itirik.

Nənəş arvadın əl-qolunu dəsmalla bağlamışdılar. Özünü maşından atacağından qorxurdular. İndi də hamı dərdini unudub onu ağlayırdı. Birdən Nənəş arvad çırpındı, səsini başına atdı:

- Ay camaat, Ədilin səsini eşidirsiz?!

Hamı nəfəsini içinə çəkdi.

Elə bil, uzaqdan, çox uzaqdan Ədil kişinin səsi gəlirdi:

- Ə, hara gedirsiz, ay evi yıxılmışlar, ölüm ölümdü, qağa, ə, vallah nahaq gedirsiz!!!

Maşın qaranlıqda yolunu azdı, biz hamılıqla vətənimizi itirdik...

Nənəm o köçdən sonra çox yaşamadı. Dərdini götürüb heç kimlə halallaşmadan çıxıb getdi. İllər keçdikcə hər gün köç bir az da seyrəkləşir. "Çaş-

qın köç" tablosu isə ürəyimin divarından elə asılıb ki, axşam-səhər yolum köçün içindən, köç içimdən keçir.

Yaddaşımı qurdaladım. Nənəm boğçası çıxdı. Bu boğçanın içindən çıxan bir xatirə idi. Görün yaddaşımda Qarabağla bağlı nə qədər xatirələr, qatı açılmamış dərdlər, ürəyimin qanı ilə çəkilmiş tablolar var.

Yaxşı ki, yaddaşımız hələ üstümüzdədir...

## TAPILMAYAN TORPAQ

**... Bir yığın adam yağışın altında əsir-yesir olub Qəribin son arzusunu axtarırdı...**

Yağış yağırdı. Axır vaxtlar belə yağdığı heç olmamışdı. Amma yağışa məhəl qoyan kim idi... Ayağı yer tutan selin-suyun içində Qəribgilin komasına tərəf qaçırdı.

Komanın qənşərinə çathaçatda Qoca Müslümün ayağı büdrədi, az qala üzüqoylu lehmənin içinə yıxılacaqdı. Kimsə qolundan tutub:

- Yavaş, ağsaqqal, getmişdin – dedi.

Komanın ağzına yığışan adamlar bir anda kənara çəkilib Qoca Müslümə yol verdilər. O da dimdiyindən su damcılayan kepkasını tələsik çırpıb içəri keçdi. Komanın ortasında Qəribi üzü qibləyə uzatmışdılar. Qonum-qonşunun kişiləri bir tərəfdə boyun-boyuna verib oturmuşdular. Küncün birində iki-üç zənən xeylağı Qəribin dilsiz-ağızsız arvadı Güləvətini kiridə bilmirdi, bayırdakı leysan kimi elə bir ucdan yumub tökürdü.

Qoca Müslüm Qəribin baş tərəfində yerə çömbəlib kepkasını yanına qoydu, boynunu Qəribə tərəf uzadıb titrək səslə:

- Olmasın azar, ay Qərib, birdən-birə nə zaval dəydi sənə? – dedi.

Qərib Müslümün sözlərini eşitsə də, cavab verə bilmədi, həyəcanlandı, təngnəfəs oldu, gözlərinin həlqəsi bir az da genəldı.

Yusif kişi dərdli-dərdli Müslümə baxdı. Bu, o demək idi ki, iş-işdən keçib, evimiz yıxılıb, Qərib də belə gedir...

Çöl-bacadan arvad-uşağın kəsik-kəsik vay-şivəni eşidilirdi. Müslüm Qəribin dərisi sümüyünə yapışmış əlini ovcunun içinə alıb kövrəldi.

- Ə, uşaqlara denən kəssinlər səslərini, Allaha şükür, Qəribin heç zadı yoxdu. Azarlayıb da... Rasim doxdur hanı ə?! – deyib çuxura düşmüş gözləri ilə adamların arasında həkimi axtardı.

Bu dəfə Yusif kişinin kal səsi eşidildi:

- Azca əvvəl gəlib Baxşəlinin nəvəsinin üstünə apardılar. Uşağı it tutub. Dərd dərd üstə gəlir, ay Müslüm. Sən deyəni o da dedi, dedi, kəndi-kəsəyi

yadına salıb, bir balaca ürəyi dolanıb Qəribin. Başqa heç nəyi yoxdu, bu gün sabah yaxjı oluf ayağa durajax.

Yusif kişi bu sözləri deyib dizlərini qucaqladı ki, yıxılmasın.

Alış Yusifin sözlərini eşidib şenlik yaratmaq istədi:

- Qardaş, o sizi-bizi yaradan Allah haqqı, o gün durduğum yerdəcə dünya başıma dolandı, az qala ölmüşdüm.

Qərib inildədi, nə isə demək istədi, boğuq, dolaşıq iniltidən başqa heç nə eşidilmədi.

Yusif kişi ürəyində özü ilə danışdı:

- Kopolunun dünyası, Qərib gedir, biz də gedəjəyik. Bu boyda dərdlə yaşamaq olar? Vallah, olmaz. Allahın altında ölüf öz dağlarımızda qalaydıx.

Qərib yenə inildədi, nə isə demək istədi, bacarmadı. Əli-ayağı kimi, dilindən də elə bil daş asılmışdı. Bircə çuxura düşmüş gözləri yaşayırdı, bu gözlərdə də ölümün kölgəsi dolaşırdı.

Şər qarışanda adamlar seyrəkləşdilər. Ağsaqqallar Güləvətini birtəhər dilə tutub balaları ilə qardaşıgilə yolladılar, özləri də boyun-boyuna verib Qəribin keşiyini çəkdilər...

...Gecədən xeyli keçirdi. Leysanın altında bütün düzəngah yuxuya getmişdi. Qəribin yayda qaraladığı komanın damı payızda etibarlı çıxmamışdı. Ələ keçən vedrə, qazan, vanna nə varsa ortalıqdaydı. Damcılar damırdı, qablar dolurdu, arabir kimsə taxta qapını cırıltıyla açıb suyu şappıltıyla çölə atırdı.

Qəribin gözləri açıq olsa da, əslində aydın, çox aydın bir yuxu görürdü.

...Yenə uşaq idi. Anasının yanına düşüb harasa gedirdi. Tez-tez də başını qaldırıb anasından soruşurdu:

- Hələ çox var?

Anası da həmişəki kimi onu ovundururdu:

- Azca qalıb, lap az.

Birdən yolları qurtardı. Uçurumun ucunda dayandılar. Anası dönüb gəldikləri yola baxdı. Gəldikləri yolun torpağı bir ucdan axıb gedirdi. Anası əlindən tutub titrək səslə dilləndi:

- Heç qorxub eləmə, səni qara yarğana verməyəcəm ha, yol qurtara bilməz, bu yolun bir yolu olmalıdır, mütləq olmalıdır.

Amma yol nə gəzirdi...

...Açıq gözləri oyandı. Dirəkdən asılmış lampanın öləzimiş işığı komanı işıqlandırdıqca Qərib qarğıdan hördüyü divarlarda titrək kölgələr görürdü. Bu kölgələr başı vurulmuş quşlara oxşayırdı. Əvvəlcə qorxdu, qışqırmaq istədi, ancaq kölgələr bir andaca doğmalaşdı. Elinin, obasının yorulub əldən düşmüş, dərddən, xəcalətdən, danlaqdan başını itirmiş kişilərinin kölgəsini

tanıdı. Bu başsız kölgələr Qəribi ürəyinin kötüyünəcən yandırdı. Ürəyi su istədi, öz dağlarının, öz bulaqlarının, öz dərələrinin suyunu. Allahın altında bircə ovuc içəydi öz dağlarının suyundan, bircə ovuc...

... Səhərə yaxın ölüm komanın açıq yanavından sivişib Qəribi səssiz-səmirsiz apardı...

... Yağış yağırdı, adamlar yağışın altında əsir-yesir olub Qəribin son arzusunu axtarırdılar. Qoca Müslüm qonşu kənddən gətirdikləri mollanın başını qatıb mərasimi bir az da uzatmaq istəyirdi:

- Bacıoğlu, Allah erməninin evini yıxsın! Qara nəhrdən əsən külək bizi öz torpaqlarımızdan qoparıb bu yerlərə atan gündən torpağımız kimi taleyimizi də itirmişik. Torpaq yaman şeydi, bala! O yerlərdən ayrı düşəndən dəfimiz dönüb. Başına dönüm, oğul, rəhmətə gedən yaxşı, ifallı adam idi. Ermənilər kəndə top-tüfənglə girəndə rəhmətliyin heç nəyə gücü çatmadı. Əl yalın, yollar bağlı, bir ovuc torpağı dəsmala büküb özüylə gətirdi ki, bu torpağa sığınıb yaşasın. Əl-ayağa keçməsin deyə, tez-tez yerini dəyişirdi. Hamıya da and verirmiş ki, öləndə o torpağı gözümə tökün, yoxsa, bundan da betər günə qalarsınız. Qəfil xəstələndi, evi yıxılmışın oğlu, dili batdı, torpağın yerini deyə bilmədi. Səhərin gözü açılandan ayağı yer tutan torpaq axtarır, harada gizlədib, hara qoyub, tapılmır ki, tapılmır.

Molla gün günorta olana kimi gözlədi, sonra gün əyildi, qaş qaralanda işin çox uzandığını görüb çıxıb getdi.

Neçə illərdi ki, yağış yağır, neçə illərdi ki, ölüm komalardan, daxmalardan, qazmalardan adamları daşıyır, neçə illərdi ki, bir milyon adam Qəribin son arzusunu axtarır. Neçə illərdi ki, yağışın altında Qəribin cənazəsi gözləyir... Lap üzə durub. Torpaq tapılmır ki, tapılmır...

## KİTAB RƏFİ




### "ÖMÜR BİTƏR, YOL BİTMƏZ"

Kitabda qədim oğuz yurdu Güləbirdin tarixi keçmişi, orada yaşamış nəsillərin şəcərəsi, son üç yüz ildə baş verən istimai-siyasi hadisələr, ermənilərin işğalçılıq siyasəti, Güləbird kəndinin döyüşçüləri, şəhidləri, əhalinin məşğuliyyəti, adət və ənənələri, ayrı-ayrı şəxsləri, habelə kənddə təhsil, mədəniyyət və s. barəsində müfəssəl məlumatlar verilmişdir.

**POEZİYA**

**Namiq ZAMAN**



### GƏLƏRƏM, DAĞLAR, GƏLƏRƏM...

Sizsiz yetim quzu kimi
Mələrəm, dağlar, mələrəm.
Bir gün olar dönüb sizə
Gələrəm, dağlar, gələrəm.

Yenə alov, od olaram,
Dərdə-qəmə yad olaram.
Sevinərəm, şad olaram,
Gülərəm, dağlar, gülərəm.

Həsrət ağartdı başımı,
Aldı əldən yaddaşımı!
Gözlərimin qan-yaşını
Silərəm, dağlar, silərəm.

Könül hər diyarı sevmir,
Tale, mən deyəni demir!
Öz ömrümdən sizə ömür
Dilərəm, dağlar, dilərəm.

Burda ömrü verib yelə,
Gün keçirrəm elə-belə.
Qədrinizi indən belə
Bilərəm, dağlar, bilərəm.

Yerə vurdular dizimi,
İndi tanıdım "özüm"ü.
Yenə siznən hər sözümü
Bölərəm, dağlar, bölərəm.

Ümidim yox gələm... Heyhat –
Gəlsəm yenə qaynar həyat!
Namiq deyər, onda rahat
Ölərəm, dağlar, ölərəm!..

### LAZIM GƏLƏRSƏ

***İndi çoxları deyir ki, "...lazım gələrsə, torpaqlarımızı işğaldan azad edərik!"***

Dedim: bu rəzalət dəyir şəstimə,
Alçaqlar millətin durub qəsdinə.
Dedim ki, yeriyək düşmən üstünə,
Dedilər: - darıxma, lazım gələrsə...

Elə ki, bir işi görmək istədik,
"Lazım" gəlməsə də, lazım bilirik.
Cəsarət sarıdan, qeyrət sarıdan
Biz "ağır oturub, batman gəlirik."

Yada yalaq olduq, doğmaya qənim, –
Qəm yedi qəlbimi, üzüm gülmədi.
Dadına yetmədi ölüb-itənin,
Hardasa yubandı, "lazım" gəlmədi.

Bilmirəm bu "lazım" kimdi, nəçidi,
Ona harayımmı, sözümmü çatar.
Bilmirəm dözümün həddi neçədi,
Sonu gözləməyə dözümmü çatar!

Qorxuram, tale də üzə gülməyə,
Bu "səbir", bu "təmkin" lüzumsuz ola.
Qorxuram axırda "lazım" gəlməyə,
Lap elə gəlsə də, lazımsız ola!

**KİMLƏR KEÇDİ BU DÜNYADAN**



## O, YARADICI İNSAN İDİ

Əhmədov Tofiq Bəşir oğlu 1934-cü ildə Laçın şəhərində anadan olmuşdur. Orta məktəbi bitirdikdən sonra 1952-ci ildə Azərbaycan Kənd Təsərrüfatı İnstitutuna daxil olmuş, 1957-ci ildə tam kursu müvəffəqiyyətlə bitirmişdir.

İnstitutu bitirdikdən sonra Laçın rayonuna təyinat almış və gənc mütəxəssis kimi öz ixtisası üzrə aqronom vəzifəsində işləməyə başlamışdır.

1959-cu ildə Laçın şəhər orta məktəbində müəllim işləmiş, 1961-ci ildə isə Laçın şəhər 1№li orta məktəbinə tədris hissə müdiri təyin edilmişdir.

1966-cı ildə Laçın Rayon Partiya Komitəsinə təlimatçı təyin edilən T.Əhmədov 1968-ci ildə "Laçın" qəzetinin kənd təsərrüfatı şöbəsinə müdir vəzifəsinə irəli çəkilir. Peşəkarlığı və işgüzarlığı sayəsində 1980-ci ildə məsul katib, 1988-ci ildən isə redaktor müavini təyin edilir.

25 il jurnalist kimi fəaliyyət göstərən T.Əhmıdov 1979-cu ildən SSRİ Jurnalistlər İttifaqının üzvü olmuşdur.

Müxtəlif səpkili yazıları hər zaman rayon sakinləri tərəfindən ehtiramla qarşılanmış, yaxşı mənada diqqəti cəlb etmişdir. Rayonun bütün kəndlərini, müəssisə və təsərrüfatlarını bir-bir gəzərək qabaqcıl işçilər, zəhmət adamları, eyni zamanda nümunəvi müəssisələr haqqında silsilə yazılar, maraqlı oçerklər qələmə almışdır.

T.Əhmədov bütöv xarakterli, şəxsiyyəti uca, sözü ötkəm, uzaqgörən, ədalətli, intellektual səviyyəli, ixtisasını gözəl bilən, xəyalı həmişə axtarışda olan jurnalist olmuşdur. Düzü-düz, əyrini-əyri yazmış, sənətdə heç kəsi təkrarlamamış, həmişə özü olmuşdur. Yəqin ki, jurnalist üçün bundan böyük ucalıq ola bilməz.

Hər zaman öz qələmi ilə xalqına xidmət etmiş, yaradıcı, yaşadıcı insan olmuşdur. Xoşbəxt o insandır ki, ulu Tanrı tərəfindən onun qismətinə xeyirxahlıq kimi gözəl, nəcib pay düşür və bu xoşbəxtlik bütün həyatı boyu onun alın yazısına çevrilir. Xeyirxah adamın qəlbi incə, ürəyi kövrək, başı uca olar. Tofiq müəllim belə bir insan idi.

T.Əhmədov xeyirxah bir insan olduğu kimi, həm də gözəl ailə başçısı idi. Övladlarının təlim-tərbiyəsi ilə ciddi məşğul olardı.

Həyat yoldaşı və 4 övladı Bakı Dövlət Universitetini bitiriblər.

Bütün insanlar ömrü boyu həyatının baharını axtarır. Amma T.Əhmədov 1992-ci ilin baharını Laçınsız yaşadı. Təbiətin ən gözəl vaxtında-fəslində torpağın sinəsini bahar çiçəkləri bəzədiyi, ana təbiət yaşıl donunu geyindiyi bir vaxtda cənnətə bənzəyən Laçından çıxan qəm karvanında T.Əhmədov da Bakıya gəldi. Ömrünün sonuna qədər Bakıda yaşadı.

1992-ci il iyul ayında Azərbaycan Respublikası İqtisadiyyat Nazirliyində "Kommersiya-informasiya" xidməti şöbəsinin müdiri vəzifəsinə təyin edilmişdir. 1999-ci ilə qədər həmin vəzifədə çalışmış, sonra təqaüdə çıxmışdır. 21 il Laçınsız yaşadı. Həmişə inamla deyirdi ki, vaxt gələcək Laçından çıxan qəm karvanı toy-bayramla geri dönəcək. Laçın həsrəti ilə yaşayan T.Əhmədov 25 dekabr 2012-ci ildə ömrünün 79-cu baharında dünyasını dəyişdi. Amma onu tanıyanların xatirəsində əbədi yaşayır və yaşayacaq.

**K.RƏHMANLI**

**ZİYALILARIMIZ**

## MÜƏLLİM ÖMRÜ



Kifayət Sadıqovanın ilk dəfə əlinə jurnal götürüb sinfə girməsindən 40 il ötür. Bu illər onun pedaqoji fəaliyyətinin müxtəlif pillələrini əhatə edir. Ona görə də Kifayət müəllimənin əmək fəaliyyətinə, keçdiyi enişli-yoxuşlu yollara qısaca diqqət yetirək:

Sadıqova Kifayət Hüseyn qızı 1949-cu ildə Laçında dünyaya göz açmış, Laçın şəhər 1№-li orta məktəbini bitirdikdən sonra Bakı Dövlət Universitetinin (indiki BDU) filologiya fakültəsinə qəbul olmuşdur. Universiteti bitirdikdən sonra 1974-cü ildə təhsil aldığı məktəbdə öz ixtisası üzrə dərs deməyə başlamış, az sonra 2№-li orta məktəbdə müəllimə, təlim-tərbiyə işləri üzrə direktor müavini vəzifəsində çalışmışdır. Zəngin mütaliəsi, mehribanlığı, doğruluğu, prinsipiallığı, insanlara qarşı qayğılı, həssas olması onu həmişə fərqləndirib, nüfuzunu artırıb.

Bir müddət Laçın rayon Komsomol Komitəsində və Laçın rayon Partiya Komitəsində çalışsa da, Kifayət Sadıqovanın əsas ömür yolu müəllimliklə bağlıdır.

Bu başdan deyək ki, ali təhsilli müəllimin hər birinin diplomunda ona ancaq müəyyən peşə, ixtisas verildiyi qeyd edilir. Yaxşı müəllim olmaq,

yenilikçi olmaq, təşkil etmək, tələb etmək qabiliyyətinə malik olmaq xüsusi diplomla müəyyən edilmir. Ona görə müəllim işləmək böyük məsuliyyət tələb edir.

Ulu öndər Heydər Əliyev demişdir: "Müəllim dünyada yeganə şəxsiyyətdir ki, cəmiyyət özünün gələcəyini, uşaqların tərbiyəsini yalnız ona etibar edir. Şəxsən, mənim müəllimə həmişə böyük hörmətim olub".

Kifayət Sadıqova həmişə axtarışda olan, yenilik axtaran, işgüzar, qayğıkeş, mehriban insandır. Elə buna görə iş yoldaşları onun haqqında həmişə ağız dolusu danışırlar. Ona böyük hörmət və ehtiramla yanaşırlar.

Yetirmələrinin çoxu həkim, müəllim, mühəndis, jurnalist və rejissordur. Sevindirici haldır ki, müəllimənin dərs dediyi şagirdlər dil-ədəbiyyat fənnindən həmişə yüksək bal toplayırlar.

Öz peşəsini sonsuz məhəbbətlə sevən Kifayət xanım ictimai işlərdə də daim fəallıq göstərmişdir. "Kommunist", "Azərbaycan müəllimi", "Laçın" qəzetlərində məqalələri işıq üzü görmüş, qabaqcıl təcrübəsi geniş yayılmışdır. Dəfələrlə şagirdlərin təlim-tərbiyəsində əldə etdiyi nailiyyələrə görə Azərbaycan Respublikasının fəxri diplomu, Laçın rayon İcra Hakimiyyətinin fəxri fərmanı ilə təltif edilmişdir.

Hal-hazırda Bakı şəhəri, Nərimanov rayonunda fəaliyyət göstərən Müseyib Müseyibov adına Laçın rayon Bozlu kənd tam orta məktəbində təlim-tərbiyə işləri üzrə direktor müavini işləyir. Şagirdlərini daim vətənpərvərlik ruhunda tərbiyə edərək deyir ki, biz təkcə Vətən uğrunda ölməyi yox, düşməni öldürməyi bacarmalıyıq. Yetərincə şəhid vermişik. Ən azı onların ruhları qarşısında öz borcumuzu vermək istəyiriksə, qanlarını yerdə qoymamalıyıq. Qoy cavanlarımız unutqan olmasınlar. Ürəklərində Vətənə məhəbbət, düşmənə nifrət hissi daha da alovlansın.

Kifayət müəllimə iki oğul, iki qız anasıdır. Gözəl tərbiyəçidir. Həm də mehriban nənədir: 10 nəvəsi, 1 nəticəsi var. Amma qəlbində hələ də böyük bir nisgil daşıyır. Ömrünün ən gözəl çağlarını keçirdiyi doğma Laçınının həsrətini sözlə ifadə etməyə çətinlik çəkir. Hərdən ağrı-acısını, umu-küsüsünü misralara da düzür:

***Bağçam vardı gül-çiçəkli,***
***Süfrəm vardı duz-çörəkli.***
***Ağsaqqallı, ağbirçəkli***
***Evlərimi görəydin kaş,***
***Mənə qaçqın deyən qardaş!***

Hər gün üzünü dağlara çevirib dualar edən bu ziyalı xanım doğma el-obasına qayıdacağı anı səbirsizliklə gözləyir və bu qayıdışa inanır. "Müqəddəs arzunuz çin olsun!" – deməkdən özgə sözümüz qalmır.

**POEZİYA**

**Elnur İRƏVANLI**



## ƏTƏKLƏ NƏSİL KÖZÜNÜ

*Bacım oğlu Səfərov İdris*
*Ramil oğlunun 5 yaşının tamam*
*olması münasibətilə*

Gül baxışın güldən gözəl,
Gözdən göyçək, dildən gözəl.
Öz elin var eldən gözəl,
Dünyadan çəkmə gözünü,
Tanrı qorusun özünü!

Səninkidir axşam, səhər,
Qucağında kişnər kəhər.
Baxışına qonmaz qəhər,
Döndər göylərə üzünü,
Tanrı qorusun özünü!

Nənə-baba sevincisən,
Sevilməkdə birincisən.
Haqq verdiyi bir incisən,
Qat ömrünə gündüzünü,
Tanrı qorusun özünü!

Oğul yetiş, kişi böyü,
Qoru yeri, qoru göyü,
Bir Vətəndir ata öyü.
Ətəklə nəsil közünü,
Tanrı qorusun özünü!



## XOŞBƏXT OLSUN NƏVƏLƏRİN

*Nizami həkimin əkiz nəvələri Fərhad*
*və Leylanın 1 yaşlarının tamam*
*olması münasibətilə*

İz qoysa da hər ötən il,
Dərd-qəmini ürəkdən sil.
Arxan ilə gələn nəsil
Halal haqqın, alın tərin.
Xoşbəxt olsun nəvələrin!

Cüt doğulan bax bu ada,
Nənə qurban, baba fəda.
Ömür adlı bu dəryada
Leyla ləlin, Fərhad zərin.
Xoşbəxt olsun nəvələrin!

Bu körpələr sərvətindi,
Adın, sanın, şöhrətindi.
El içində hörmətindi,
Çiçək açıb pöhrələrin,
Xoşbəxt olsun nəvələrin!

Tanrı göndərən anamın,
Coşan eşqin, qaynar qanın.
Hər birisi dağ inamın,
Hər birisi zirvələrin.
Xoşbəxt olsun nəvələrin!

***15.04.2013***

POEZİYA

**Alimə GİZLİNUR**



### ALDANMA DOSTUM

Saxta məhəbbətə, saxta sevgiyə,
Saxta ləyaqətə aldanma, dostum.
İllərlə içini gizli yandıran
Saxta mərhəmətə aldanma, dostum.

Xəyanət oxuyla tuşlayıb səni,
Bələyib qəlbinə kədəri-qəmi.
Sən onun sözünə baxdın yenəmi?
Ötəri şöhrətə aldanma, dostum.

Eşqi-məhəbbəti qanan da sənsən,
Ayrılıq oduna yanan da sənsən.
Həqiqət də sənsən, yalan da sənsən,
Yalançı hörmətə aldanma, dostum.

### NİYƏ AYRI SALDIN VÜQARI MƏNDƏN

Mən sənə nə deyim, a zalım fələk,
Niyə ayrı saldın Vüqarı məndən?
Öz əlinlə öz evini yıxasan,
Niyə ayrı saldın Vüqarı məndən?

Mən sənə demişdim dözmərəm onsuz,
İşıqlı dünyada gəzmərəm onsuz.
Sənə qarğamaqdan bezmərəm onsuz...
Niyə ayrı saldın Vüqarı məndən?

Sənin də sabahın zülmətə dönsün,
Nur saçan gözlərin buludtək dolsun.
Sevdiyin mənimtək biçarə qalsın,
Niyə ayrı saldın Vüqarı məndən?!.

### TALEYİM

Bu gözəl dünyada, gözəl həyatda
Elə bil borandı, qardı taleyim.
Daima hicranda, gözü yollarda
Qalan bəxtiqara yardı taleyim.

İşıqlı dünyada zülmətə düşdüm,
Kədərlə, qüssəylə qovrulub bişdim.
Keçilməz yolları çox çətin keçdim,
Küsdüm... Ümidimi qırdı taleyim.

Dəryalar üzündə od olub yandım,
Dedim bir sınaqdı, keçəcək sandım.
Çətin həyatımı hamıdan dandım,
Gördüm ki, ellərə cardı taleyim.



VETERANLARIMIZ

## SADIQOV ƏBİL ŞAHVERDİ OĞLU



1928-ci ildə Laçın rayonunun Dəyirmanyanı kəndində doğulmuşdur. 1942-ci ildə Mığıdərə kənd orta məktəbini bitirdikdən sonra 1949-cu ilin sentyabrınadək Mığıdərə kəndinin də daxil olduğu 7 para kəndi özündə birləşdirən “Baş Sovet” adına kolxozda baş mühasib vəzifəsində işləmişdir.

1949-cu ildə Ağdam 2 illik Müəllimlər İnstitutunun fizika-riyaziyyat fakültəsinə daxil olmuşdur. 1951-ci ildə həmin institutu bitirərək təyinatla Mığıdərə kənd orta məktəbində fizika-riyaziyyat müəllimi kimi pedaqoji fəaliyyətə başlamışdır. 1953-cü ildə Sov.İKP sıralarına üzv qəbul olunmuş, həmin ildən 1957-ci ilə qədər Mığıdərə kənd orta məktəbində partiya təşkilat katibi vəzifəsində işləmişdir.

Bundan sonra Laçın rayon Partiya Komitəsinə təlimatçı vəzifəsinə təyin edilmiş, 1959-cu ildə isə Laçın rayon Partiya Komitəsinin təqdimatı ilə imtahan verərək Bakı Ali Partiya məktəbinə qəbul olunmuşdur. 1963-cü ildə Bakı Ali Partiya Məktəbində təhsilini başa vurmuş, Laçın rayon Partiya Komitəsinin təşkilat şöbəsinin müdiri vəzifəsində çalışmışdır. Həmin il rayon partiya komitəsinin plenum üzvü, 2 seçki rayon partiya komitəsinin büro üzvü seçilmişdir.

1969-cu ildə Maarif Nazirliyi tərəfindən Laçın rayon internat-məktəbinə direktor təyin olunmuş, 1974-cü ildə öz razılığı ilə tutduğu vəzifədən azad edilmişdir. 1974-cü ildə Laçın rayon Xalq Deputatları sessiyasının qərarı ilə Laçın rayon İcraiyyə Komitəsinin katibi vəzifəsinə seçilmişdir. Azərbaycan Respublikası Prezidentinin fərmanı ilə icraiyyə komitələri ləğv edildiyinə görə 31 dekabr 1991-ci ildə Laçın rayon İcraiyyə Komitəsinin katibi vəzifəsindən azad edilmişdir.

1992-ci ildən 1995-ci illədək Laçın rayon Xalq Deputatları Sovetində ümumi şöbənin müdiri vəzifəsində çalışmışdır. Ehtiyatda olan kapitandır. 35 il Laçın rayon sovetinin, şəhər sovetinin deputatı olmuşdur.

4 oğlu, 5 qızı var. Onlardan 6 nəfəri ali təhsilli, 3 nəfəri xüsusi orta təhsillidir. Həyat yoldaşı isə müəllimdir. 57 il müxtəlif vəzifələrdə işləyən Əbil Sadıqov hazırda Azərbaycan Respublikası Ağsaqqallar Şurasının üzvüdür.

**POEZİYA**

**Elburus ABBASOV**



### DAĞLAR
### BİZİM DAĞLAR DEYİL

Yağışı var, qarı da var,
Dağlar bizim dağlar deyil.
Qoyun, quzu, malı da var,
Dağlar bizim dağlar deyil.

"Quzu mələr, çoban gülər",
Qonşu yurddan qonaq gələr.
Köhlən kişnər, itlər hürər,
Dağlar bizim dağlar deyil.

Meşəsi var, talası var,
Cüyür, kəklik balası var.
Ayağında xınası var,
Dağlar bizim dağlar deyil.

Bulaq üstə el qızları,
Dovğasında yarpızları.
Süfrəsində cız-bızları,
Dağlar bizim dağlar deyil.

Əks-səda eşitmədim,
Çox baxdım, qartal görmədim.
Səfərimdən sevinmədim,
Dağlar bizim dağlar deyil.

Elburusam, sinə dağlı,
Qonaq getdim təmtəraqlı.
Alaçıqlar al çıraqlı,
Dağlar bizim dağlar deyil.
Dağlar bizim dağlar deyil.

**İsmayıllı, Lahıc yaylağı**
**18.08.2012**

### NAHAQ ENDİM
### O DAĞLARIN BAŞINDAN

Zirvələrdə daşa dönüb qalaydım,
Nahaq endim o dağların başından.
Orda nə var qadasını alaydım,
Nahaq endim o dağların başından.

Dağ-daşından qoşa bulaq çıxardı,
Biri qaynar, biri buztək axardı.
Sel gəlməmiş ildırımlar çaxardı,
Nahaq endim o dağların başından.

Meşəsi var, talası var, dağı var,
On iki ayın doqquzunda yağar qar.
Lap zirvədə yuva qurar qartallar,
Nahaq endim o dağların başından.

Cökə balı dolu olar pətəyi,
Köhlən oynar, qoyun-quzu ətəyi.
Söylə görüm xoş gəlmirdi bəs nəyi?
Nahaq endim o dağların başından.

Yalayaydım duz əvəzi daşını,
Dəmləyəydim qırxbuğumla aşını.
Soruşmamış zirvələrdən yaşını,
Nahaq endim o dağların başından.

Dərisində bişirərdim quzunu,
Gətirdərdim "buzxananın" buzunu.
Kaş qalaydım orda ömrüm uzunu,
Nahaq endim o dağların başından.

Daşlarında Koroğlunun izi var,
Hər söhbətdə Dədə Qorqud sözü var.
"Ağ qayada" Sultan bəyin özü var,
Nahaq endim o dağların başından.

Qeybə çıxıb at oynadan kənd qızı,
Yox olubdur yanağından qırmızı.
Qəmə dönüb cavanların avazı,
Nahaq endim o dağların başından.

Kaş ki, qardaş o dağlara köçəydim,
Bal süzülən bulaqlardan içəydim.
Qocalıram, məzar yeri seçəydim,
Nahaq endim o dağların başından.

Elburusdan yaman küsüb o dağlar,
Atıb gələn el-obasın soraqlar.
Ev dağılıb, sönüb bütün çıraqlar,
Nahaq endim o dağların başından.
Nahaq endim o dağların başından.

**Ağcabədi, Taxtakörpü**
**29.12.2012**

**Seyid CƏFƏR**

## ÇOXDU

Yerin, göyün ahəngi var,
Naxışlardan çələngi var.
Təbiətin min rəngi var,
Açan çoxdu, solan çoxdu.

Düşmüşük dərdə, azara,
Son qoyulmur ahu-zara.
Hər yan dönübdü bazara,
Satan çoxdu, alan çoxdu.

Bu dünyanı qana-qana,
Ayrı düşdü bala, ana.
Vətən deyib yana-yana
Ölən çoxdu, qalan çoxdu.

## DAĞLAR

İnsanlardan haqq küsəndə,
Eləmədim heyrət, dağlar.
Yamacları sel basıbdı,
Dərələri zülmət, dağlar.

Parça-parça paralandıq,
Düz ürəkdən yaralandıq.
Daha səndən aralandıq,
Bitəcəkmi həsrət, dağlar?

Körpə baxar bağa sarı,
Xəstə gözü sağa sarı.
Boylanırıq dağa sarı,
Üzüb bizi qürbət, dağlar.

**ARAŞDIRMA**

## II DÜNYA MÜHARİBƏSİNDƏ İTKİN DÜŞƏN LAÇINLILAR…

**Nəsibov Xanlar Nəsir oğlu** 1900-cü ildə Laçın rayonunun Minkənd kəndində doğulmuşdur. 1941-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. İtkin düşmüşdür.

**Nəsibov Nəsib Xanlar oğlu** 1920-ci ildə Laçın rayonunun Minkənd kəndində doğulmuşdur. 1941-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. İtkin düşmüşdür.

**Nəsirov Məmməd Vəli oğlu** 1922-ci ildə Laçın rayonunun Minkənd kəndində doğulmuşdur. 1943-cü ildə Laçın RHK-dan orduya çağırılmışdır. İtkin düşmüşdür.

**Nəzərov Nəriman Məhəmməd oğlu** 1910-cu ildə Laçın rayonunun Minkənd kəndində doğulmuşdur. 1943-cü ildə Laçın RHK-dan orduya çağırılmışdır. İtkin düşmüşdür.

**Qəhrəmanov Şükür Salman oğlu** 1921-ci ildə Laçın rayonunun Minkənd kəndində doğulmuşdur. 1942-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər 1942-ci ildə itkin düşmüşdür.

**Qəhrəmanov Şükür Səməd oğlu** 1921-ci ildə Laçın rayonunun Minkənd kəndində doğulmuşdur. 1941-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər 1945-ci ildə itkin düşmüşdür.

**Qarayev Məmməd İsmayıl oğlu** 1921-ci ildə Laçın rayonunun Minkənd kəndində doğulmuşdur. 1943-cü ildə Laçın RHK-dan orduya çağırılmışdır. İtkin düşmüşdür.

**Qafarov Muxtar Məhəmməd oğlu** 1910-cu ildə Laçın rayonunun Minkənd kəndində doğulmuşdur. 1942-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. İtkin düşmüşdür.

**Qafarov Murad Məhəmməd oğlu** 1910-cu ildə Laçın rayonunun Minkənd kəndində doğulmuşdur. 1943-cü ildə Laçın RHK-dan orduya çağırılmışdır. İtkin düşmüşdür.

**Quliyev Teyyub Səfər oğlu** 1924-cü ildə Laçın rayonunun Minkənd kəndində doğulmuşdur. 1941-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. İtkin düşmüşdür.

**Mənbə:**

• Azərbaycan Respublikası Xatirə Kitabı, III cild, Q hərfi, Bakı, 2001
• Azərbaycan Respublikası Xatirə Kitabı, XI cild, M, N hərfi, Bakı, 2011

*Hazırladı*: **Araz YAQUBOĞLU**

